through the trial period, the employee should be informed about its duration and what is there for him after this period ends. In addition, it should be noted that the efficiency of the implementation of the assigned duties also depends on the range thereof and how well the employee understands them. Another ethical problem is the evaluation of job skills. Special attention is given to two issues when talking about the evaluation of job skills in foreign practice. First comes the official evaluation of the job skills of an employee. In most companies, the job skills of each employee are evaluated on a yearly basis and this is recorded in their personal information form. The evaluation score usually has an impact on the salary and it becomes a document in which employees' skill levels are recorded regularly. The second is the unofficial evaluation of the job skills of the employee. This is the consequent evaluation as to how an employee carried out the duties assigned to them in the course of a year. In this case, the manager evaluates the quality of the work based on the daily fulfillment of obligations. As a result of this daily observation, an annual assessment is conducted, and therefore, each employee tries to do their job more responsibly. This process also prevents the possible unreasonable ideals of employees. But it is undeniable that there are still cases of a subjective approach to employee evaluation and this is not considered a fair case at all from the point of justice.

Another complicated ethical problem is the issue with taking disciplinary actions. Most managers hesitate in relation to taking disciplinary actions and choose to wait. Most of them turn a blind eye to the shortcomings of their employees and believe that the situation will resolve itself. At the same time, it is really important to take disciplinary actions in the case of obvious violations for different reasons. Not only does this help to increase productivity, but this also defines definite standards for certain behavior that is important for employees. Taking disciplinary actions must be carried out in the most constructive and professional way. The employee cannot be criticized in front of other people. It is important to listen to the other side when taking disciplinary actions. Disciplinary actions should be resolute, strict, and reasonable but they cannot be stricter than what is stipulated in the legislation. Managing employees is based on principles like mutual justice, honest work, transparency, etc. These are the main moral values of every society. Recruitment of a person does not mean handing over their personal life, secrets, and rights to the company, these rights cannot be restricted even in the company.

## Conculsion

Various sections and departments of different significance degrees, different functions, and qualities operate in the structure of the enterprises. As one of these departments, Human Resource Department definitely has special importance. These departments will today and in the future improve productivity, profitability, market shares, competitiveness, reputation, and material and moral values at a maximum level. The main duties of these departments are the proper selection of staff members, improvement of their knowledge and skills, and creation of a fair environment in the workplace. Establishing the relationship between managers and employees and also the proper relationship among employees improve the quality of the work done and increases productivity even more. From this point of view, it is important to follow ethical norms in business activities. The conducted research once again concludes that it is extremely important that the management activities of human resources conform to the criteria of business ethics on theoretical and practical levels.

## References

1. Erdem, H.(2010), The Impact of Business Ethics on Corporate Social Responsibility. Unpublished Master Thesis. Istanbul: Marmara University Institute of Social Sciences.
2. Geyushov, Z. (1998), Ethical thought in Azerbaijan, Baku: Ganjlik.
3. Kök, S. (2010), İş razılaşması və qruplaşmaların əlaqələrinin incələnməsinə yönəlmiş bir araşdırma. Atatürk Üniversiteti İqtisad və İdari Elmlər Dərgisi.
4. Qılınclı, Y., Çalıq, A. (2021), İnsan Qaynaqları idarə olunmasının tətbiqinin qruplaşmalar üzərindəki təsiri: Van İli nüm.. Ərciyəs Üniversiteti İqtisadi və İdari elmlər fak.dərgisi.
5. Mərcin, L. (2005), İnsan Qaynaqları idarə olunmasının təhsil qurumları baxımından vacibliyi və inkişafı , Elektronik Sosial Elmlər Dərgisi.
6. Özüpək, M. (2013), Qurum İmici ve Sosial məsuliyyət. Konya: Təhsil Yayınevi.

7. Raizberg, B.A. (1995), Fundamentals of business. Moskva: Nauka.
8. Torlak, O.(2013), Ethics, Conduct and Business Ethics, N. Tokgoz, Business Ethics, (2-18) Eskishehir: Anadolu University Publishing House
9. Unsur, A. (2020), Human and Ethics at Work (Business Ethics). Istanbul: Degerler Education Center Publications.
10. Yuksel, I. (2019), An Overview on Contemporary Professional Ethics Debates from the point of Ahi-Order Philosophy. Bilecik Sheyh Edebali University Journal of Social Sciences Institute, 4 (2), pp.500-537.
11. Yumurtacı, O. (2015), Evaluation of the Concept of Mobbing in the Framework of Business Ethics and a Study on the Banking Sector. Unpublished Master Thesis. Ankara: Ufuk University Institute of Social Sciences.
12. Zeynalov, S.E. (2022), A Research on the Relationship between the Concept of Business Ethics and Human Resource Management and the Effect of This Relationship on the Job Satisfaction of Employees. Unpublished Master Thesis. Istanbul, Nisantasi University graduate education institute.

Received: 26.06. 2022 Accepted: 01.08. 2022

DOI: https://doi.org/10.36719/2663-4619/81/19-24

**Nəzakət Rza qızı İsmayılova**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
nezaket.ismayılova@yahoo.com

# DÜNYANIN POETİK DƏRKİ UŞAQ ƏDƏBİYYATINDAN BAŞLAYIR

**Xülasə**

Bu elmi məqalədə uşaq və gənclərin mənəvi tərbiyəsinin formalaşmasında, dünyagörüşünün genişlənməsində azərbaycançılıq ideologiyası baxımdan, uşaq ədəbiyyatının ən yeni metodologiyaya uyğun azərbaycançılıq məfkurəsi istiqamətində öyrənilməsi günümüzün vacib məsələləri kimi qarşıya qoyulmuşdur. Belə ki, Respublikamızın ən böyük strateji xətti olan təhsilimiz bu gün dünya ölkələri sisteminə inteqrasiya etməsi bu sistemin yeni standartlar əsasında qurulması, ali məktəblərdə təhsilin məzmun baxımından yeniləşməsini tələb edir. Məhz bu tələblərə cavab verə bilən mütəxəssislər hazırlamaq üçün şübhəsiz ki, ali məktəblərdə tədris planı, proqramlar, dərslik, dərs vəsaitləri tədrisə köməkçi metodik vəsaitlər yenidən işlənməli həm tədris metodiki, həmdə elmi nəzəri baxımdan onların səviyyəsi günün tələbləri səvyyəsində qurulmalıdır. Bu baxımdan yanaşılaraq deyə bilərik ki, uşaqlar üçün yazılan əsərlər həcmcə azlıq təşkil etsə də, ümumilikdə, uşaq psixologiyasını düzgün anlayan, onu istədiyi məcraya yönəltməyi bacaran, saf uşaq şüurunda mütərəqqi, pedaqoji tərbiyənin əsasını anlatmaq baxımından, dəyərli bədii nümunələr yazılır.

Apardığımız araşdırmada ədəbi irsə yeni çağdaş milli təfəkkür müstəvisində, zamanın tələbinə uyğun olaraq təhlilər edilmişdir. Uşaq ədəbiyyatının tədrisi ənənəvi materiallarla yanaşı, həm də bu sahədə əldə olunan son elmi nailiyyətlər tələbatcılara necəçatdırılır? Bu gün uşağın daxili duyğularını, sevincini, əzablarını, psixoloji-ruhi yaşantılarını bütöv şəkildə ortaya qoyan əsərlərə ehtiyacımız cox böyükdür. Bu problem bütün dövrlərdə olduğu kimi, bu gün də aktual olaraq qalmaqdadır. Uşaq ədəbiyyatının keçdiyi yol, inkişaf qanunauyğunluğu, mövzu və problem dairəsi haqqında çox bəhs edilib. Bəs çağdaş uşaq ədəbiyyatının problemləri, mövzu dairəsi nədir, hansılardır.

***Açar sözlər:*** *Azərbaycan, tədris, təhsil, metodika, uşaq ədəbiyyatı*

**Nazakat Rza Ismailova**

## Poetic understanding of the world starts from children's literature

**Abstract**

In this scientific article, the study of children's literature in accordance with the latest methodology in the direction of the ideology of Azerbaijaniism in the formation of the spiritual education of children and youth, and the expansion of their worldview, from the point of view of the ideology of Azerbaijaniism, has been put forward as important issues of today. So, the integration of our education, which is the biggest strategic line of our republic, into the system of the world countries today requires the establishment of this system on the basis of new standards, and the renewal of education in higher schools in terms of content. In order to prepare specialists who can meet these requirements, the curriculum, programs, textbooks, and teaching aids in higher schools must be reworked, both from a teaching methodical and scientific theoretical point of view. Approached from this point of view, we can say that although the works written for children are a minority in volume, in general, valuable artistic examples are written in terms of explaining the basis of progressive, pedagogical education in the mind of a pure child, which correctly understands child psychology, is able to direct it in the desired direction.

In our research, the literary heritage was analyzed at the level of modern national thinking, according to the requirements of the time. How to teach children's literature along with traditional materials, but also the latest scientific achievements in this field are delivered to the students? Today, we have a great need for works that reveal the child's inner emotions, joys, sufferings, and psychological-spiritual experiences as a whole. Much has been said about the path of children's literature, the regularity of development, the

subject and the scope of problems. But what are the problems and scope of contemporary children's literature?
***Keywords:*** *Azerbaijan, teaching, education, methodology, children's literature*

## Giriş

Azərbaycan uşaq ədəbiyyatı özünəməxsus inkişaf yolu keçməkdədir. Uşaq ədəbiyyatı dünyası öz mövzuları və süjetləri, fərqli qəhrəmanları, dili və üslubu olan bir ədəbiyyat kimi inkişaf etməkdədir. Azərbaycan uşaq ədəbiyyatının bir neçə yaradıcı nəsli böyük ədəbiyyat meydanında öz sözünü deməkdədir. Bunu da qeyd etməliyəm ki, böyük nəsil ücün əsər yazmaq nə qədər asan olduğu kumu, uşaqlar üçün bədii əsərlər yazmaq çətin məsuliyyətli, eyni zamanda humanist bir işdir. Bu yazıçıdan həssas müşahidə, uşaq psixologiyasını dərindən duymaq, düşündüklərini sadə, aydın bir dillə qələmə almaq qabiliyyəti tələb edir Bu barədə Azərbaycanın xalq şairi S. Vurğun demişdir: "Uşaqlar üçün yazılmış hər bir əsərin əsasında məna gözəlliyi yaşamalıdır. Mənası dayaz, qayəsi və məqsədi aydın olmayan ötərgi hisslə, tərənnüm olunan əsərlər uşağın hafizəsində ani bir qığılcım kimi parlayıb sönür". (Xəlil, Ələsgərli, 2007: 9). Bəli, məna gözəlliyi həqiqətlə nəfəs almalıdır. Bu sözlər nəcib xeyirxah, cəmiyyətdə gərəkli bir inasan yetişdirilməsi üçün vətəndaş çağrısıdır.

Azərbaycan uşaq ədəbiyyatı yaşadığımız dünyanın maddi və mənəvi zənginliklərini yeni nəslə öyrətməli onları bu sərvətin varisi kimi tərbiyə eləməlidir. Onun üçün də bu ədəbiyyatın yolu düzgün olmalıdır ki, gələcəkdə cəmiyyətə xidmət edən uşaq da tutduğu yolu düzgün seçə bilsin. Hər bir uşaqdan insan, vətəndaş tərbiyə etməliyik ki, o aydın və işıqlı sabahını görə bilsin. Buna görə də hər bir yazıçı və şair əsərini yazarkən uşaq kitablarının dilinə xüsusi əhəmiyyət verməlidir (Həsənli, 2007: 16). Ətrafımızda baş verən yenililkəri, kəşfləri ixtiraları elmi naliyyətləri, tarixdə baş vermiş hadisələri və s. asan və maraqlı dillə nəql etməyi bacarmalıdır.

Cağdaş dövrdə yeni tipli məktəblərin, kolleclərin, litseylərin meydana gəlməsi bu kimi yeniliklər zamanın tələbinə uyğun olaraq ana dilində dərslik və dərs vəsaitlərinə diqqətin artırılmasını tələb edir. Maarifçilik dalğasının geniş intişarı, mətbuat şəbəkəsinin genişlənməsi, xüsusilə uşaqlar üçün jurnalların nəşri genişlənməli yeniliklərlə yeni mövzularla təzahür etməlidir. Bütün bunlar uşaq ədəbiyyatının inkişafına təkan verən amillərdir. Bütöv bir ziyalı zümrəsinin milli təəssübkeşliyi sayəsində yaradılmalı, uşaq ədəbiyyatı məhz, sağlam və təməlli başlanğıcdan nəşət tapdığı üçün bu gün də yaşama və var olma gücündədir.Bütün sahələrdə olduğu kimi, uşaq ədəbiyyatına münasibətdə də kəmiyyət dərəcəsi keyfiyyətə nisbətən qat-qat artıq olan bir durumda yaşayırıq.

**Tədqiqatın məqsədi:** H.Əliyev demişdir: "Uşaq ədəbiyyatı uşaqları zəngin mənəvi və estetik zövqə malik, zəmanəsinin ən humanist biliklərinə yiyələnən yetkin bir insan kimi tərbiyə etməlidir." (9,s.3). Ana dilini qoruyub saxlamaq və uşaqlara sevdirmək Azərbaycan uşaq ədəbiyyatının ən böyük tarixi nailiyyəti olmalıdır. Akadekik İ. Həbibbəyli deyir: "Əsl uşaq ədəbiyyatı - ən yaxşı ana dili dərsliyidir. Vətənpərvərlik - uşaq ədəbiyyatının canı və ruhudur. Uşaq ədəbiyyatı Azərbaycan ədəbiyyatının əbədi Vətəniyyəsidir". Sadə və aydın ana dilində yazılmış və vətənpərvərlik üstündə köklənmiş Azərbaycan uşaq ədəbiyyatı xalqımızın müstəqil dövlətçilik uğrunda mübarizəyə hazırlanmasına şərəflə xidmət etmişdir. Uşaqların böyük həyata hazırlanmasını uşaq ədəbiyyatı olmadan təsəvvür etmək mümkün deyildir. Uşaqların ətraf aləm haqqındakı ilkin təəssüratları ailə mühitində formalaşmaqda olan tərbiyəvi keyfiyyətlərin üstünə gəlir və onu daha da zənginləşdirir.

Azərbaycan uşaq ədəbiyyatının zəngin bir tarixi vardır. Bu ədəbiyyatın problemləri həmişə ədəbiyyatşünasların, yazıçıların, tərbiyəçilərin, müəllimlərin valideynlərin diqqət mərkəzində olmuşdur. XX əsrin əvvəllərində maarifpərvər ziyalıları - müəllim və yazıçıları uşaq mətnləri yazmağa təhrik edən səbəblərdən biri də məktəblərdə şagirdlərin mütaliəsi üçün qiraət kitablarının yoxluğu idi (İsmayılova, 2004: 139) Ona görə maarifpərvər yazıçılar ana dilində yalnız dərsliklər deyil, sinifdənxaric oxu üçün kitabların yazılması qayğısına da qalırdılar. Bu gün də ziyalıları uşaq ədəbiyyatının bütün əhatə və çalarlığında inkişafı düşündürməli dövrün tələbinə uyğun əsərlər yazmalıdırlar. Yəni necə yazmaqla yanaşı, həm də nə yazmaq, hansı janrda mövzu meydana qoymaq barədə düşünməklə yanaşı eyni zamanda uşaq şeirləri, təmsillər, nağıllar deyil, həm də güclü hekayələrin yazılması yazarları düşündürməlidir.

Uşaq ədəbiyyatına son dövrdə ölkəmizdə baş verən ictimai-siyasi hadisələr -I Qarabağ müharibəsi, işğal olunmuş yurd yerlərimiz, şəhid olan Vətən oğulları, II Qarabağ müharibəsi 28 il işğal altında qalmış torpaqlarımız, yeraltı sərvətlərimiz, tarixi yerlər, abidələr, insanların yaşayış yerləri və s. bir-bir qələmə alınmalı gələcəyimiz olan varislərinə catdırılmalıdır. Bundan başqa 44 günlük zəfər tariximizi yazan şəhid oğullarımızın hər biri haqqında, onların qəhrəmanlıq səlnamələri bütün bunlar yazılmalıdır. Ölkəmizdə baş verən I,və II Qarabağ müharibəsində uşaqların acı həyat hekayələri, müharibələrin törətdiyi fəlakətlər, insanların ev-eşiyinin dağılması, yurd- yuvalarından didərgin düşmələri və s. mövzular qələmə alınmalıdır. İnsan sevgisinin tərənnümü, insanın insana məhəbbəti, şəxsiyyətlə zaman arasında təzadlar, bəşəri kədər bu kimi duyğular aşılanmalıdır. Bundan başqa yaşadığımız dünyanı bürüyən texnoloji sivilizasiyanın uşaq baxışlarından dərki. Məhz belə mövzulara diqqətlə yanaşsaq görərik ki, elə müstəqillik dövrü Azərbaycan ədəbiyyatını qapsayan mövzulardır.

Ədəbiyyatşünaslarımızdan, yazıçılarımızdan M.Cəfərin, B.Nəbiyevin, S.Əhmədovun, Y. Kərimovun, Elçinin, Q.Namazovun, T.Mahmudovun, Z.Xəlilin və başqalarının Azərbaycan yazıçılarının qurultaylarında, plenumdakı məruzələrində çıxışlarında, eləcə də dövri mətbuatda dərc edilən məqalələrində uşaq ədəbiyyatının ayrı - ayrı problemləri, onun qarşısında duran vəzifələri ön plana çəkilmişdir. Tənqidçilərimizdən Ş. Alışanov, M.Qasımlı, N.Şəmsizadə və başqaları da uşaq ədəbiyyatına həsr olunmuş məqalələri ilə çıxış etmiş, onun uğur və nöqsanları barədə danışmışdılar .

Azərbaycan uşaq ədəbiyyatı səciyyələndirilərkən demək lazımdır ki, bu ədəbiyyatın yalnız Quzey istiqaməti tədqiq olunaraq öyrənilib. Bu gün milli mənafelərimizi dəyərləndirdiyimiz bir zamanda aparılan təhlillərə Güney Azərbaycanda yaranmış uşaq ədəbiyyatınında qatılması ədəbiyyatımızın tamlaşmasına, bütövləşməsinə şərait yaradar. (Bunu da qeyd etmək yerinə düşər ki, Cənubi Azərbaycan uşaq ədəbiyyatı sistemli şəkildə öyrənilib araşdırılmamışdır. N.R)

Bu sahədə özünü təsdiq edən sənətkarların yaradıcılıq nümunələrini öyrənib, təhlilə cəlb etmək günün vacib məsələsi kimi qarşıda durur.

Zaman və həyat daima inkişaf edib, dəyişildiyi kimi, uşaq ədəbiyyatı da ümumən tədrisin inkişafında yeni forma və metodları ilə zənginləşməlidir. Bu gün qədəm qoyduğumuz bu tarixi şəraitdə tərbiyənin milli zəmində həyata kecirilməsinə özümüzü - özümüzə tanıdan əsərlərin tədrisinə diqqətimizi cəlb etmək daha məqsədəuyğundur. Bu işdə Azərbaycan uşaq ədəbiyyatı fənninin tarixini və spesifik inkişaf xüsusiyyətlərini özündə əks etdirən, haqqında hərtərəfli dəqiq elmi təsəvvür yaradan, müasir mündəricəli dərslik və dərs vəsaitlərinin, yeni proqramların tərtib olunması, onun elmi metodiki keyfiyyətlərini yaxşılaşdırmaq, zənginləşdirmək və təkmilləşdirmək baxımından çox az iş görülmüşdür.

Uşaq ədəbiyyatı XX əsrin 20-ci illərindən başayaraq bu illər ərzində tədris edilməsinə baxmayaraq, üzərində müəyyən dəyişikliklər aparmaqla illər boyu ehkam kimi qəbul olunmuş şəkildə tədris olunur. Zaman keçdikcə tarixlər bir-birini əvəzlədikcə bu fənnin yeni dərs vəsaitinə, yeni proqrama zamanın tələbinə uyğun olaraq günü - gündən inkişaf etməlidir. Lakin Azərbaycan uşaq ədəbiyyatı fənninin tədrisinin yenidən milli mənafelər mövqeyindən, dövrünün tələbinə uyğun "Azərbaycançılıq" məfkurəsi zəminində qurulması günün ən vacib məsələlərindəndir. Məhz bu baxımdan yanaşdıqda çox təəssüflə qeyd etməliyik ki, milli uşaq ədəbiyyatı yazmaq uğrunda mübarizə aparıb, onun elmi nəzəri əsaslarını hazırlayan dəyərli nümunələrini yaradan pedaqoq-yazıçıların böyük əksəriyyəti mövcud proqram və dərsliklərin dairəsindən kənara çıxa bilməmiş bu iş bir şablon kimi dönə-dönə təbliğ olunub şüurlarda möhkəmlənməsinə gətirib çıxarmışdır.

Uşaq ədəbiyyatı fənni tədris olunarkən, niyə Azərbaycanın Güney qolunda yaşayan Vətən, millət təssübü ilə doğma ana dilimizdə min bir çətinliklə də olsa yazıb -yaradan sənətkarların əsərlərini geniş tədqiq edib yeni nəslə çatdırmırıq? Uşaqlara vətən-pərvərlikdən, torpağa, el-obaya məhəbbətdən danışırıq, ancaq ömrünü - gününü vətənin, xalqın birliyinə həsr edən B.Q.Səhəndin "Sazımın sözü", "Araz", M.H. Savalanın mayasını xalqdan alan "Apardı sellər Saranı", H.Tərlanın "Araz gülür", H.F. Xoşginabinin "Iki qardaş", S.Behrənginin "Balaca qara balıq", "Məhəbbət nağılı", K.M.Sönməzin "Isanın son şamı", M.H. Rüştiyyənin, M.C.Bağcabanlı, B.Azəroğlunun "Elə oğul istəyir Vətən" və s. tədris zamanı keçirilərsə, tələbələrdə vətənpərvərlik ruhunun formalaşmasına müsbət təsir göstərər. Əlbəttə, Azərbaycan uşaq əsərləri səciyyələnərkən, yanlız Quzey qolu istiqamətində təhlillər aparmışıq. Bu gün isə milli təfəkkür baxımından aparılan təhlillərə Güney uşaq ədəbiyyatının da qatılması Azərbaycan uşaq ədəbiyyatının inkişafına tamıaşmasına şərait yaradacaq (İsmayılov, 2006: 15).

Uşaq ədəbiyyatı XIX əsirdən təməli olaraq bir elm kimi öyrənilməyə başlanmış, ümumi ədəbiyyatın bir hissəsi kimi lap qədim dövrd ən bu günədək onunla bir yol gəlmişdir.

Burada "Avesta" kitabəsi, Zərdüştün atəşpərəstlik fəlsəfəsinin mahiyyəti burada xeyirlə-şərin mübarizəsi, milli adət - ənənələrin bədii əksi, Əski türk dastanları, "Yaradılış", "Alp Ər Tonqa", "Şu", "Oğuz" və. s dastanları uşaqların maraq darəsini, yaş xüsusiyyətlərini pedaqoji prinsiplərə əsaslanaraq mülazirələr verilməlidir. Bu dastanların əsas ideyası mərdlik, qorxmazlıq və qəhrəmanlıqla bağlıdır. Bu ənənələrdə yeni nəslin vətənpərvərlik ideya estetik tərbiyəsində böyük əhəmiyyət kəsb edir (Xəlil, Ələsgərli, 2007: 40). Bütün bunlar xalqın ruhu ilə qidalanan nağıl şəklini alan tarixlərdir.

Qədim və orta əsr Azərbaycan ədəbiyyatı uşaq mütaliəsi nümunələri formasında yazılmalıdır. Beləliklə də Azərbaycan uşaq ədəbiyyatının tarixi, onun nəzəri məsələləri, keçdiyi inkişaf yolu, qanuna uyğunluqları izahlı şəkildə öyrənilərək tədris olunmalıdır.

Xalqımızın çox əsrlik şifahi xalq yaradıcılığının mühüm bir hissəsini uşaq folkloru təşkil edir Bir az əvvəldə göstərdiyimiz kimi, uşaq ədəbiyyatı bir elm kimi XIX əsrdə təşəkkül tapmasına baxmayaraq ümumi ədəbiyyatın tərkib hissəsi kimi uzun illərdən bəri xalq öz folklorunda uşaqlara məxsus olan pedaqoji və bədii estetik tərbiyə metodunun ideal nümunəsini yaratmışdır. (AUƏ, 2002: 6.) Uşaq folkloru nümunələri, həm ideya, həm məzmun, həm də forma cəhətdən uşaqların yaş xüsusiyyətlərini nəzərə alaraq yaranmışdır. Öz qaynaqlarını əsrlərin dərinliyindən alan Azərbaycan uşaq ədəbiyyatının yarnıb formalaşmasında uşaq folklor nümunələrinin mühüm yeri var (Qafarlı, 2013: 25). Nağıl qəhrəmanlarınının təsvirində fantastik səhnələr, xüsusilə xeyirin şər üzərində qələbəsi, obrazlar sistemi, bədii təsvir və ifadə vastələri, həyatın real təsviri, uşaq dünyasının poetik dərki deməkdir.

Epik folklor nümunələri olan nağılların kompozisiya xüsusiyyətləri, mənəvi-əxlaqi problemlərin anlaşıqlı olması uşaqları asan qavramasına səbəb olur. (Namazov, 2007: 11). Heyvanlar haqqında nağıllar "Ağ quş nağılı", "Tülkü və canavar", "Axmaq canavar", "Şəngülüm, Şüngülüm və Məngülüm" və. s bu az yaşlı uşaqların diqqətini daha yaxşı cəlb edir. Sehirli nağıllardan danışarkən "Məlikməmməd", "Ağ atlı oğlan", "Vur, çomağım vur", və başqaları xalq məişətinin canlı təsviri, haqq-ədalət uğrunda mübarizə, müsbət qəhrəmanların obrazı xalqın ən yaxşı keyfiyyətlərini özündə birləşdirmişdir. Bütün bunların uşaq tərbiyəsində cox böyük tərbiyəvi əhəmiyyəti vardır.

Ümumiyyətlə, bütün nağıllar uşaqlar üçün maraqlıdır. Ancaq alloqorik nağıllar daha maraqlı və böyük ustalıqla yaradılmışdır. Burada da uşaqların yaş xüsusiyyətləri, psixologiyası, maraq dairəsi çox məharətlə nəzərə alınmışdır. Alleqorik nağılların əksəriyyətində müxtəlif heyvanlar iştirak edir. Nağılların yuxarıda qeyd etdiyimiz növlərindən başqa bu növü konkret və lakonik olaraq daha yadda qalandır. Burada hadisələr aydın və yığcam təsvir olunur. Sehirli nağıllardakı kimi deyil, həqiqət ünsürləri daha çoxdur.

Azərbaycan şifahi xalq yaradıcılığı nümunələrindən biri olan tapmacalar da uzun bir inkişaf yolu keçmişdir. Xalqımızın həyat və məişətinin mühüm sahəsində istifadə olunmuşdur. Tapmacaların açılması uşaqlarda çevrik təfəkkür vərdişi, yüksək ağıl, hazırcavablıq, düşünmək qabiliyyəti inkişaf etdirir. (AUƏ, 2004: 7)Azərbaycan uşaq ədəbiyyatının özünə məxsus inkişaf yolu olmuşdur. Bizim zəngin tariximiz, qədim mədəniyyətimiz və milli-mənəvi dəyərlərimiz "Kitabi-Dədə Qorqud" eposunda öz əksini tapmışdır . Bu epos bizim ümumi sərvətimizdir."Dədə Qorqud" dastanında olan adət ənənələr xalqımızın keçmiş həyat tərzindən xəbər verən ən səciyyəvi xüsusiyyətlərdir. Bu ənənələr yeni nəslin vətənpərvərlik və ideya-estetik tərbiyəsində və öyrənilməsində böyük əhəmiyyət kəsb edir. (Azərbaycan folkloru, 2005: 7)

XIX əsirdə Azərbaycanda realist-maarifçi ədəbiyyatın canlanması Azərbaycan və rus dillərində məktəblərin açılması, yeni mündəricəli dərsliklərin hazırlanması şübhəsiz ki, yeni uşaq ədəbiyyatının təşəkkülünə təkan verdi. Əsrin birinci yarısında Abbasqulu ağa Bakıxanovun və Qasımbəy Zakirin nəsihətamiz və satirik mənzum hekayə və təmsilləri yarandı. Əsrin ikinci yarısında bu səpgidə yazılan əsərlər Azərbaycanda yeni mündəricəli uşaq ədəbiyyatının yaranmasına zəmin yaratdı. Bu da Seyid Əzim Şirvaninin yaradıcılığı ilə yeni mərhələyə daxil oldu. Bundan sonra bir sıra sənətkarların uşaq əsərləri yaratmaq təşəbbüsləri artdı. Bu həm də yeni -yeni təhsil ocaqlarının açılmasıda aydın hiss olunurdu ki, uşaqların təlim-tərbiyəsinə xüsusi kömək göstərən didaktik əhəmiyyətli, yüksək bədii səviyyəli əsərlərə böyük ehtiyac vardır. Elə buna görə də Azərbaycan müəllimlərinin birinci qurultayından sonra maarifpərvər ziyalıların təşəbbüsü ilə uşaq ədəbiyyatını inkişaf etdirmək məqsədi ilə "Dəbistan", "Rəhbər", "Məktəb" jurnalları nəsrlə başlamış daha çox tərbiyə işi ilə məşğul olan yazıçılar, bu jurnallar üçün əsərlər yazmış, uşaq oxusu üçün ilk dərsliklər tərtib etmişlər. Necə deyərlər, dövrün, zamanın tələbi

uşaq ədəbiyyatının peşəkar səviyyədə formalaşmasına şərait yaratdı. Bəllidir ki, hər hansı milli ədəbiyyatın zənginləşməsində və inkişafında tərcümə ədəbiyyatı böyük əhəmiyyət kəsb edir. (Babayev, 2017: 75). Tərcümə ədəbiyyatı vasitəsilə xalqlar bir-birinin həyat və məişət tərzini, adət və ənənələrini, psixologiyasını, mədəni tərəqqisini, inkişafını və mübarizə tarixini öyrənir (Xəlil, Ələsgərli, 2007: 11). Bu, eyni zamanda milli ədəbiyyatların qarşılıqlı inkişafına böyük təsir göstərir.

Dünya ədəbiyyatının ən yaxşı nümunələri hələ keçən əsrin ortalarından başlayaraq Azərbaycan xalqının mənəvi sərvətinə çevrilmişdir. Ana dilinin tədrisi milli dərsliklərin yaranması zərurətini ortaya atdığı zaman klassik yazıçılarımızın bədii irsi içərisində uşaq ədəbiyyatı nümunələri çox az idi. Mövcud nümunələri isə dil və məzmunca qəliz olduğundan uşaqların təfəkkür səviyyəsinə və ruhunü uyğun gəlmirdi. Buna görə də dərslik tərtib edən müəlliflər qabaqcıl dünya ədəbiyyatının, xüsusən rus ədəbiyyatının seçmə nümunələrindən tərcümə yolu ilə istifadə edirdilər.

XIX əsrdən başlayaraq mütərəqqi rus yazıçılarının zəngin məzmunlu, uşaq ruhuna yaxın olan əsərləri Azərbaycan dilinə tərcümə olunub dərsliklərə daxil edildi. Bu dövrdə İ A.Krılovtın təmsilləri, A.S.Puşkinin nağılları, M.Y.Lermontovun şeirləri, L.Tolstoyun hekayələri yalnız uşaq ədəbiyyatını deyil, həm də yeni mündəricəli Azərbaycan ədəbiyyatını zənginləşdirdi.

Bəşər mədəniyyətinin humanist ideyalar tərbiyə edən ən nadir nümunələri Azərbaycan dilinə tərcümə edildi, milli mədəniyyətimizin xəzinəsinə daxil oldu. Şərq ədəbiyyatından qədim hind abidəsi "Kəlilə və Dimnə", ərəb xalqlarının əfsanələri ilə zəngin olan "Min bir gecə" dastanı, "Qabusnamə", bir çox Şərq xalqlarının uşaq ədəbiyyatı nümunələri toplanmış "Oxuyan piyalə" kitabı. Firdovsi, Xəyyam, Sədi, Hafiz, Cami, Xosrov Dəhləvi, Nəvai kimi sənətkarların nə- sihətamiz-ibrətamiz kəlamları, ümumiyyətlə. Şərq aləmi, Şərq psixologiyası. Şərq mədəniyyəti haqqında geniş və zəngin bilik əldə etməyə imkan verir.

Həmçinin Qərb ölkələri ədəbiyyatının ən nadir nümunələri: Qrim qardaşlarının nağılları, məşhur Danimarka yazıçısı H.Andersenin nağıl və hekayələri, D.Defonun «Robinzon Kruzo», C.Sviftin «Qulliverin səyahəti», Mark Tvenin, Jül Vernin, Mayn Ridin, Çarlz Dikkensin, E.Seton Tompsonun, C. Rodari və digər görkəmli sənətkar və yazıçıların seçilmiş əsərləri uşaqların oxu imkanlarını xeyli artırmışdır.Ölkəmizin xarici ölkələrlə qarşılıqlı mədəni əlaqəsi uşaq ədəbiyyatının zənginləşməsi üçün zəmin yaratmışdır.

Bu gün texniki təkamül elə bir zirvəyə qalxmışdır ki, kompüter və internet vasitəsilə yer üzərində yaşayan bütün xalqların həyat tərzi ilə təbəddülatıyla gündəlik tanış olmaq mümkündür. Və bizim bugünkü gənclik bəşəriyyətin sivil inkişafını öyrənməli, özünün yaratdığı mənəvi sərvəti də dünyaya yaymalıdır. Bu yöndə uşaq ədəbiyyatı ən mühüm vasitələrdən biridir.

## Nəticə

Yekun olaraq deyə bilərik ki, uşaq ədəbiyyatı ümumi ədəbiyyatın cox mühüm tərkib hissəsidir. Cəmiyyətin inkişaf keyfiyyətləri uşaqların tərbiyə və bacarığından xeyli dərəcə asılı olduğundan onların düzgün istiqamətdə yetişdirilməsi, milli- mənəvi keyfiyyətlərlə zənginləşdirilməsi ücün ədəbiyyatın müstəsna əhəmiyyətini inkar etmək olmaz. Bu anlamda uşaq ədəbiyyatına aid örnəklərin araşdırılıb üzə cıxarılması, onların ədəbi- bədii məziyyətlərinin, yeniliklərinin, özəlliklərinin müəyyənləşdirilməsi zəruridir. Naxçıvan regionuna xas olan yazarların yaradıcılığında ədəbiyyatımız üçün zəngin material verən faktlar vardır. Sözügedən yazarların yaradıcılığının həmin istiqamətdə araşdırılması bir tərəfdən, ümumazərbaycan ədəbiyyatı ilə bağlı problemlərin araşdırılması üçün yararlıdırsa, digər tərəfdən, indiyə qədər sosializm prinsirləri baxımından yanaşılan və ya diqqətdən yayınıb layiqli qiymətini almayan, halbuku ulu tarixi olan möhtəşəm bir ədəbiyyatın formalaşıb təşəkkül tapmasında müəyyən rolu olan sənətkarlara bugünkü prizmadan yanaşmaq, tarixi şəxsiyyətlərin yazdıqlarını cağdaş müstəviyə gətirmək baxımından da əhəmiyyətlidir.Dünyanın poetik dərki uşaq ədəbiyyatından başlayır. Məhz elə buna görədə gələcəyimiz olan uşaqları düzgün tərbiyələndirmək, onlara hər şeyin düzgün olanını göstərmək, elmi biliklərə yiyələnmək, dərrakəli olmaq, vətəni, təbiəti, bəşəriyyəti sevmək, hümanist insan, vətəndaş tərbiyə etməkdə əlbəttə uşaq ədəbiyyatının mühüm əhəmiyyəti vardır.

**Ədəbiyyat**

1. Azərbaycan folkloru (2005), Məktəblər üçün seçmələr. (tərtib edəni və ön sözün müəllifi B.Abdulla), Bakı: Elm.
2. Azərbaycan nağılları. (2005), Naxçıvan 5 ciliddə, 1ci c. Bakı: Şərq-Qərb.
3. Azərbaycan uşaq ədəbiyyatı antologiyası. (2004), Üç cilddə. II cild, Bakı: Öndər nəşriyyatı.
4. Azərbaycan uşaq ədəbiyyatı müntəxəbatı (2002), II cild Tərtib edəni X.Məmmədov, A.Həsənov, Bakı, Nasir.
5. Babayev, R., Ə. Hüseynzadə, Ş. Əliyeva (2017), "Naxçıvan uşaq folklorundan örnəklər" Bakı, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişaf Fondu.
6. Dədə Qorqud dünyası. məqalələr. (2004), H.Əliyev. Milli varlığımızın möhtəbər qaynağı. Bakı Öndər nəş.
7. Həbbibəyli, İ. (2017), Ədəbi şəxsiyyət və zaman, Bakı: Elm və təhsil.
8. Həsənli, B. (2007), "Azərbaycan uşaq ədəbiyyatı. (Dərs vəsaiti) Müəllim nəş.Bakı
9. Xəlil Zahid, Ələsgərli F. (2007), Uşaq ədəbiyyatı (Ali və otra ixtisas məktəbləri üçün dərslik) ADPU-nin nəşriyyatı.
10. İsmayılova N. (2008), Naxçıvan ədəbi mühiti və uşaq ədəbiyyatı. Naxçıvan bu gün: islahatlar, perspektivlər. 5-6 oktyabr 2007. Beynəlxalq simpoziumun materialları. AMEA Naxçıvan Bölməsi, A.A.Bakıxanov adına Tarix İnstitututu, NDU, Nurlan.
11. İsmayılova N. (2016), Naxçıvan ədəbi mühiti: uşaq ədəbiyyatının inkişaf istiqamətləri və problemləri. (dərs vəsaiti) Bakı: "Elm və təhsil nəş.
12. İsmayılova, N.R. (2004), Ali məktəblərdə uşaq ədəbiyyatı fənninin tədrisinin yeni aspektdə qurulması yolları. Müasir təlim metodları və yeni pedaqoji texnologiyanın təlim-tərbiyə prosesində tətbiqi mövzusunda keçirilən elmi-praktik konfransın materialları. NMİ, "Məktəb" nəşriyyatı.
13. İsmayılova, N.R. (2005), Müasir uşaq şeirində folklor nümunələri. Müasir təlim metrdları və yeni pedaqoji texnologiyanın təlim-tərbiyə prosesində tətbiqi mövzusunda keçirilən elmi-praktik konfransın materialları (26 may 2005), Naxçıvan: NMİ, Məktəb.
14. İsmayılova, N.R. (2006), Azərbaycan uşaq ədəbiyyatının tədrisi prosesində Cənub mövzusunun öyrədilməsi. Metodik vəsait. NMİ, "Məktəb" nəşr.
15. Qafarlı, R. (2013), Uşaq folklorunun janr sistemi və poetikası, Bakı: elm və Təhsil.
16. Namazov Q. (2007), Azərbaycan uşaq ədəbiyyatı. (Ali məktəb üçün dərslik), Bakı, Bakı Dövlət Universiteti nəşriyyatı.
17. Namazov, Q. (2007), Azərbaycan uşaq ədəbiyyatı Ali məktəb üçün dərslik, Bakı: Bakı universiteti nəşriyyatı
18. Yusifoğlu, R. (2006), Uşaq ədəbiyyatı. (Dərs vəsaiti). Bakı: Elm.

Göndərildi: 19.06. 2022 Qəbul edildi: 29.07. 2022

DOI: https://doi.org/10.36719/2663-4619/81/25-32

**Əsmətxanım Bəyəhməd qızı Məmmədova**
Baki Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
kamillik@mail.ru

# NİZAMİ GƏNCƏVİ ƏSƏRLƏRİNDƏ FONETİK ƏVƏZLƏNMƏLƏR

**Xülasə**

Bu məqalədə fonetikanın səs əvəzlənmələri, səs dəyişmələri kimi maraqlı bir hadisəsini klassik bədii irsimizin misilsiz incisi olan Nizami "Xəmsə"sinin beytləri daxilində araşdırmağa çalışmışıq. Fars dili samitlərinin bir-biri ilə əvəzlənmələri həm səs tellərinin iştirakına görə, həm də əmələgəlmə yerlərinə - artikulyasiyaya görə hər biri 3 bölüm daxilində tədqiq edilmişdir. Tədqiqatdan aydın olmuşdur ki, karlıq-cingiltililik, eləcə də əmələ gəlmə üsuluna görə samit səslər tələffüzü asanlaşdırmaq üçün öz xarakterlərini dəyişir, bir-biri ilə əvəzlənirlər. Tədqiqat boyu "Xəmsə"də işlənən iki fakültativ variantın hansı birinin Nizami dövründə daha işlək olduğu da imkan daxilində araşdırılmışdır.

***Açar sözlər:*** *Azərbaycan dili, fars dili, fonetik əvəzlənmə, cingiltili samit, kar samit*

**Asmetkhanim Bayahmad Mammadova**

## Phonetic gradations in the works of Nizami Ganjavi

**Abstract**

In this article, we have investigated an interesting phenomenon of phonetics such as sound gradations and sound changes within the verses of Nizami's "Khamsa", which is an incomparable gem of our classical heritage. Gradations of Persian consonants were studied in 3 parts, each according to the participation of vocal cords, places of formation, and articulation. It became clear from the research that consonant sounds change their character and replace each other in order to facilitate pronunciation due to Voiceless -Voiced , as well as the way of formation. During the research, which of the two facultative options used in "Khamsa" was more effective during the Nizami period was investigated as far as possible.

***Key words:*** *Azerbaijani language, Persian language, fhonetic gradation, voiced consonant, voiceless consonant*

## Giriş

Ümumdünya ədəbiyyatına, mədəniyyətinə verdiyi misilsiz və nadir töhfələri ilə Nizami Gəncəvi (1141-1209) Şərq və dünya poeziyasının ən yüksək zirvəsini fəth etmiş az sayılı dühalardandır. Təsadüfi deyildir ki, Nizami "Xəmsə"si bütün dünyada ən çox əlyazması olan və sonrakı dövrlərdə də çox sayda nəşr olunmuş, demək olar ki, dünyanın canlı dillərinin əksəriyyətinə tərcümə edilmiş, yüzlərlə şairin nəzirə mənbəyi olmuş təkrarsız sənət incisidir.

Nizami və onun ədəbi irsi haqqında istər Azərbaycanda, istərsə də Azərbaycanın hüdudlarından kənarda müxtəlif yönlü araşdırmalar aparılmış, nizamişünaslıq üzrə müasir elmi əsaslara və metodologiyaya söykənən mühüm işlər görülmüşdür. Lakin bütün bunlarla yanaşı, Nizami dünyası və onun zəngin bədii irsi haqqında təsəvvürlərimiz, təbii ki, mükəmməl deyildir, bu sahədə hələ də boşluqlar, elmi yetərsizlik özünü göstərməkdədir.

Dahi Nizaminin əsərləri hər bir klassik abidələrimiz kimi dilçiliyin müxtəlif bölmələri, eləcə də fonetika bölməsi üçün misilsiz araşdırma mənbəyidir. Bu tədqiqatımızda fonetikanın səs əvəzlənmələri, səs dəyişmələri kimi maraqlı bir hadisəsini klassik irsimizin misilsiz incisi olan "Xəmsə" beytləri daxilində araşdırmağa çalışmışıq.

### "Xəmsə"də fonetik əəvəzlənmələr

Azərbaycan dilində *fonetik əvəzlənmə* adlanan bu dil hadisəsi, ingilis dilində: - *fhonetic gradation;* fars dilində:- *təbdil-e ava* adlanır. "Tarixi əvəzlənmədən fərqli olaraq fonetik əvəzlənmə fonemlərin

danışıq aktındakı qarşılıqlı təsirindən və ya fonemlərin işlənmə mövqeyindən asılıdır. Fonetik əvəzlənmə iki cür olur: 1) mövqe ilə bağlı əvəzlənmə; 2) kombinator əvəzlənmə. Birincisi mövqe ilə bağlı olduğu halda, ikincisi qonşu fonemlərdən asılıdır" (Dilçilik Ensiklopediyası, 2008: 349)

Fars dili səsləri və sözlərinin tarixi əvəzlənmələri haqqında ətraflı məlumat almaq üçün (bax: Bəhar, 1382: 208-220; Bağeri, 2002: 116)

Məlumdur ki, hər bir dilin dildaxili sisteminin qaydalarından irəli gələn və daimi olaraq meydana çıxan özünəməxsus qanunları vardır. Məsələn Hind-Avropa dillərinin bir çoxunda, eləcə də fars dilində söz sonunda və kar samitlərlə qonşuluqda cingiltili samitlərin karlaşması fonetik hadisəsi mövcuddur. "Türk dillərində, o cümlədən Azərbaycan türkcəsində ahəng qanununu, həmahəngliyi buna misal kimi göstərə bilərik. Bildiyimiz kimi dilimizdəki doğma sözlərimizdə söz kökünün birinci hecasında gələn sait ona əlavə edilən bütün sonrakı hecalardakı sait və samitləri qalın-incə və dodaqlanan-dodaqlanmayan ahəngində tənzimləyir" (Veysəlli, 1993: 73).

**I Səs tellərinin iştirakına görə fars dili samitlərinin əvəzlənmələri**

Karlıq-cingiltililik əlamətinə görə samitlərin əvəzlənməsi "Xəmsə"də geniş yayılmış fonetik hadisələrdəndir. Fonetik məhdudiyyət qanunundan törənən hallar fonetik, bədii-üslubi, leksik-qrammatik cəhətdən dilçilik və poetika müstəvisində araşdırılarkən maraqlı nəticələrə gəlinmişdir. Tədqiqat nəticəsində məlum olmuşdur ki, bu dildə mövcud olan hər bir fonetik hadisə, eləcə də bədii fiqurların bir çoxu elə adını çəkdiyimiz məhdudiyyət qanununun hökmü altında baş verir.

**1. Söz sonunda cingiltili samitin kar samit fonemlə əvəzlənməsi:**

/əsb → əsp/- "at"; /kəsb → kəsp / - "qazanma", "işləmə", "əldə etmə". Nümunələrə müraciət edək. "Xosrov və Şirin" dastanında "Şirinin Mədainə qaçması" bölümündən aldığımız bu beytdə /əsb/ kimi yazılan söz cingiltili /b/-nin kar qarşılığı olan /p/ - kar samiti ilə tələffüz edilir: .

/ke gər banu befərmayəd be şəbgir,
pey-e Şirin beranim **<u>əsp</u>** çon tir./

(Nizami, 1370: 138)

*(Əgər Məhinbanu ardınca getməyə (basqına) razılaşsa,*
*Ox kimi Şirinin ardınca **<u>at</u>** çapmağa hazırıq )*

Yenə də həmin məsnəvidən nümunə gətirdiyimiz başqa bir beytdə deyilir:

/qəza - ra əspşan dər rah şod sost,
dər an mənzel ke an məh muy mişost.../

(Nizami, 1370:142)

(O ayın (Şirinin) saçlarını yuduğu yerdə
Təsadüfən atı yolda yoruldu (zəiflədi).

Diqqət etsək, "Xosrov və Şirin " dastanından gətirdiyimiz hər iki nümunədə /əsb/ sözünün son cingiltili samit fonemi /b/- nin ardınca kar samit fonemlər /ç/ və /ş/ gəlmişdir. /əsb **<u>ç</u>**on/ və /əsp**<u>ş</u>**an/- belə halda dediyimiz cingiltili samitin kar samitlə əvəzlənməsi fonetik hadisəsi tam şəkildə özünü nümayiş etdirir. Belə ki, /b/ tam şəkildə kar variantı olan /p/ ilə əvəzlənir : /əs**bç**on → əs**<u>p</u>** <u>ç</u>on/; /əs**<u>bş</u>**an → əs<u>pş</u>an/ kimi tələffüz edilir.

Qeyd edək ki, söz sonunda gələn cingiltili samitdən sonra gələn leksemin

ilk səsi sait fonem, yaxud cingiltili samit olarsa o zaman karlaşma hadisəsi tam deyil, yarımçıq şəkildə baş verir. Həmin dastandan seçdiyimiz aşağıdakı iki beytdəki nümunəyə diqqət etsək dediyimiz tezis aydınlaşar:

/gər in bot can-e mən budi, çe budi?
vər in **<u>əcb an-e</u>** mən budi, çe budi?/

(Nizami, 1370: 142)

(Bu gözəl mənim canım olsaydı, nə olardı?
Və yaxud, o at mənim olsaydı, nə olardı?)

/feşandənd ab-e qol bər çehre-ye mah,
bebəstənd **<u>əsb-ra</u>** bər axur-e şah./

(Nizami, 1370: 143)

(O ayüzlünün çöhrəsinə gülab səpdilər,
Atını isə şahın atının axuruna bağladılar.)

Bu beytlərdəki /əcb an-e mən/- "at mənim" və / əsb-ra / "atı" leksemlərində səslərin distributiv vəziyyətinə baxsaq, birinci beytdəki /əsb/- leksemindəki /b/dan sonra /an-e mən/- "mənim", "mənə məxsus" leksemindəki /a/ sait fonemi; ikinci beytdə isə /əsb-ra/ -"atı", "atını" leksemindəkı ossilloqraf lentlərində özünü sait kimi nümayiş etdirən /r/ sonoru gəldiyindən cingiltili samitin karlaşması tam deyil, yarımçıq olmuşdur. Bu bir daha hər bir dilin fonetik qanunlarının nə qədər sabit, dəyişilməz olduğunun nümayişidir.

Nizamini həmişə düşündürən və əsərlərində ana xətt kimi keçən adil şah obrazını vəsf edən şair "Yeddi gözəl" dastanında "Bəhramın atasının taxtına oturması" bölümündə gənc şahın insanların qayğısına qalmasını, vergini azaltmasını, əhalinin dincəlməsi, istirahəti üçün günü iki hissəyə bölməsini təsvir etdiyi hissədə deyir:

/ruz fərmud ta do qesmət kərd,
nime`i **<u>kəsb</u>** o nime`i xərd./

(Nizami, 1370: 548)

*(Əmri ilə gün iki hissəyə bölündü,*
*Yarısında **<u>işləmək</u>**, yarısında yemək)*

Bu beytdə verilmiş /kəsb/ sözündə də /b/ cingiltili samitdən sonra gələn /o/ saiti cingiltili samitin tam şəkildə karlaşmasına mane olur.

**2. Söz ortasındakı cingiltili samitin kar samit fonemlə əvəzlənməsi:**

Bildiyimiz kimi ərəb dilindən fars dilinə keçmiş sözlərin bir qrupu adlıq hal şəkilçisiz adətən bir hecalı /CVCC/ tipli /səbr, dərs, vəqt, nəqş/.... kimi leksemlər olur. Belə alınma sözlərin ortası və sonunda 2 kipləşən samit yanaşı gələrsə, bu

samitlərin biri məxrəcini dəyişərək sürtünən novlu samitə keçir. Bu əvəzlənmənin əsasında isə artikulyasiya orqanlarının vəziyyətini asanlaşdırmaq qanuniyyəti durur. Məsələn: səs tellərinin iştirakına görə kar, əmələgəlmə yerinə görə dil-diş samiti /t/ səsinin təsiri ilə /q → x /-ya keçir - / vəğt→ vəxt /– "vaxt"; Yaxud səs tellərinin iştirakına görə kar, əmələgəlmə yerinə görə dilortası novlu /ş/ samiti, xarakterinə görə bir qədər mürəkkəb olan cingiltili, kipləşən /q/ samitini kar, novlu /x/ samiti ilə əvəzlənməyə məcbur edir. Beləliklə, / q → x/- ya keçir və / nəqş → nəxş / – "nəqş", "rəsm"; / nəğşha → nəxşha / – "rəsmlər", "şəkillər" kimi tələffüz edilir.

"Yeddi gözəl" məsnəvisindəki "Xeyr və şər"in hekayəsindən nümunə gətirdiyimiz aşağıdakı beytdə olduğu kimi:

/**<u>vəxt - vəxt</u>** əz rəfiq ponhani,
mixord çon rəhiğ-e reyhani./

(Nizami, 1370: 642)

*(**<u>Arabir</u>** öz yoldaşından xəlvəti,*
*Reyhan şərabı kimi suyu içirdi )*

Yenə də "Yeddi gözəl"dən verdiyimiz aşağıdakı nümunədə cəm şəkilçisi qəbul etmiş /nəqşha→ nəxşha /– "rəsmlər", "şəkillər" kimi tələffüz edilməlidir.

/dər qoşadi-yo dər şodi be beheşt,
didi an **<u>nəxşha-ye</u>** xub sereşt./

(Nizami, 1370: 536)

*(Qapını açıb behiştə daxil oldu,*
*O gözəl yaradılmış **<u>şəkilləri</u>** gördü )*

Başqa bir nümunədə isə kar /s/ samitinin təsiri ilə / q/ cingiltili samiti kar /x/ samiti ilə əvəzlənir. Qrafikada, yazıda "qaf" /q/ yazılsa da, tələffüzdə dediyimiz fonetik hadisəyə, uyuşmaya görə /x/ samiti səslənir.

Məsələn "Qızıl Arslan Toğrul şahın Nizamini görüşə dəvət etməsi" bölməsində görüşə gedən şair Azərbaycanın abad yollarından, şəffaf bulaqlarından, ürəkaçan mənzərəsindən vəcdə gələrək bu sevincini belə bəyan edir:

/borun randəm suy-e səhra şetaban,
gerefte **<u>rəxs</u>** dər kuh o beyaban.
ze **<u>rəxs</u>** rəh nemişod təb` sirəm,
ze mən **<u>rəqqastə</u>**r mərkəb bezirəm./

(Nizami, 1960: 784)

(Gah dağla, gah səhrayla gedirdim,
Gedib səhra boyunca **rəqs** edirdim.
Ürək doymurdu **rəqs** ilə gedirdi,
Səməndim məndən artıq **rəqs** edirdi)

Qeyd etmək lazımdır ki, bu əvəzlənmələr təkcə Hind Avropa dilləri ailəsinə aid olan fars dilinə deyil, eləcə də türk dilləri ailəsinin Oğuz qrupuna daxil olan Azərbaycan dilinə də aiddir. Müasir Azərbaycan dilində karlıq-cingiltililik əlamətinə görə samitlərin əvəzlənməsi də nisbətən geniş yayılmış fonetik fonetik hadisələrdəndir. Dilimizdəki kar və cingiltili samitlərin demək olar ki, hamısı müvafiq fonetik şəraitdə öz kar və cingiltili qarşılıqları ilə fonetik əvəzlənməyə girirlər. Belə ki, hər bir dilönü, cingiltili samit öz kar qarşılığı ilə əvəzlənir. Məsələn /d → t/ əvəzlənməsi: *bulud – bulutsuz; süd – sütsüz; görmüşdü- görmüştü* və s. / z → s/ əvəzlənməsi: *yaz-yassa; poz-possa; gəz-gəssə* və s. (Axundov, 1984 : 220)

**3. Cingiltili samitin kar samitlə əvəzlənərək, kar samiti qoşalaşdırması**

Bu əvəzlənmə "...fars dilində geniş yayılmış fonetik hadisələrdən assimilyasıya uyuşma fonetik hadisəsisinə uyğun gəlir" (Hatəmi, 1955: 111) . Bəzən birinci sözün son səsi ilə ikinci sözün birinci səsi səs tellərinin iştirakına görə fərqli qrupdan olduqda tələffüzdə çətinlik əmələ gəlir. /abpəz/ - "suda bişmiş", şəbpəre/- "yarasa", /bədtər/- "daha pis" və s. Misallardan göründüyü kimi yanaşı gələn /b/ və /p/; /d/ və /t/ samit fonemləri səs tellərinin iştirakına görə fərqli qruplara aiddirlər. Belə ki, bu sözlərdəki /b/, /d/ cingiltili; /p/, /t/ isə kar samit fonemlərdir. Odur ki, tələffüzün asanlaşması üçün dil öz potensialından istifadə edərək cingiltili samitləri kar samitlərə çevirir. /şəbpəre → şəppəre/ - "yarasa"; /abpaş → appaş/- "su çiləyən"; /abpəz → appəz/ - "suda bişmiş"; /bədtər → bəttər/ - "daha pis" kimi tələffüz edilir.Nümunələrə diqqət edək:

/şəb çon pər-e zağ bər sər avərd,
**şəppəre** ze xab sər bər avərd./

(Nizami, 1370: 430)

*(Gecə qarğa qanadıtək geyindi qara,*
***Yarasa*** *oyanıb, qaranlığa qovuşdu )*

Nizami məsnəvilərində "yarasa" / şəbpəre / sözü bir dəfə "Leyli Məcnun"da "Məcnunun qarğa ilə söhbəti" bölümündə özü də tam şəkildə işlənmişdir. Onun assimilyasiya olunmuş /şəppərə/- kimi qrafik nümunəsinə təsadüf etmədik.

/məqu kəz zər o saheb-e zər ke beh,
gereh **bədtər** əz bənd o bənd bədtər əz gereh. /

(Nizami, 1947: 430)

(Qızıl, ya sahibi yaxşıdır? - Sorma sən,
Düyün bənddən pisdir, bənd də düyündən.)

Beytin mənasını aşağıdakı kimi şərh etmək olar: "Qızıl sahibi qızıl kisəsinə vurulmuş bir düyün kimi, qızıl isə sahibinin ayaqlarına vurulmuş bənd kimi olduğundan, deməli hər ikisi pisdir."

(Nizami, 2004: 242)

/xəsmi-ye kəjdom betər əz əjdəhast,
kin ze-to ponhan bovəd, an bərmələst./

(Nizami, 1947: 228)

*(Əqrəbin düşmənçiliyi əjdəhadan daha pisdir,*
*Çünki, bu gizli, əjdaha isə açıq-aşkar düşməndir)*

Qeyd edək ki, məsnəvilərdə danışıq dilindən alınmış /bətər/-in işlənmə tezliyi /bədtər/- ə nisbətən daha üstündür.

Hikmət nümunəsi olan ustad Nizaminin beytləri dillərdə dolaşan qanadlı sözlər, bir çox hallarda isə xalq deyimlərinin, atalar sözlərinin poetik dildə yüksək bədii ifadəsidir. "Xosrov və Şirin" dastanından seçdiyimiz nümunəyə diqqət yetirək: .

/zəbanəş sər be sər tir o təbər bud,
yekayek ozreş əz cormeş **bətər** bud./

(Nizami, 1960 : 597)

*(Dilində balta idi, bir də ox firavan,*
*Günahından betərdi üzrü yeksan)* (Nizami, 2018:320)

Həmin dastanda rastlaşdığımız başqa bir nümunədə yenə də "Gözləmək ölümdən bətərdir, pisdir","dərdlər içərisində gözləri yolda qalmaqdan daha pisi yoxdur"- kimi hikmətli ifadənin Nizami qələmində necə də axıcı və mənalı səslənişinin bir daha şahidi oluruq:

/həmişe çeşm dər rəh del do nim əst,
bəla-ye çeşm bər rahi əzim əst.

əgərçe hiç qəm bidərd - e sər nist,
qəmi əz çeşm - e bər rahi betər nist./

(Nizami, 1947: 228)

(Həmişə gözü yolda qalanın ürəyi bölünər,
Gözü yolda qalanın bəlası, dərdi böyükdür.

Düzdür ki, hər bir qəm dərd-sərsiz deyildir,
Ancaq gözləri yolda qalanın dərdindən pisi yoxdur)

**II Əmələgəlmə yerinə görə samitlərin əvəzlənməsi**

**1. /n → m/ fonetik əvəzlənməsi**

Leksemlərin distributiv xüsusiyyətlərində əgər iki müxtəlif artikulyasiyalı samit yanaşı gələrsə, dil tələffüzü asanlaşdırmaq üçün onlardan birinin məxrəcini dəyişir. Əmələgəlmə yerinə görə müxtəlif artikulyasiyalı /nb/ samitləri fərqli xüsusiyyətlərə görə formalaşırlar. Daha asan tələffüzə keçmək üçün dil öz imkanlarından istifadə edərək, yaxın məxrəcli /mb/ samit birləşməsinin tələffüzünə üstünlük verir. Yəni, dil-diş səsi /n/-nı qoşa dodaq samiti /b/- ya uyğun olaraq, /m/ samiti ilə əvəzləyir. Aşağıdakı sözlərdə olduğu kimi: /şə**nb**e → şə**mb**e/ – "şənbə"; /conbid →combid / – "titrədi", "lərzəyə gəlmə" ; /donbe → dombe/ – "quyruq" , /ənbər → əmbər/-"ənbər" və s.

Göründüyü kimi yuxarıda verdiyimiz misalların hər birində /b/ fonemindən öncə gələn /n/ səsi /m/ fonemi kimi tələffüz olunur. Bu leksemlərdə olan "nun" **/n/ -** nın tələffüzü üçün dilin ön hissəsi ön damağa sıxılır, dil bu vəziyyətdən sonra /b/ - nın deyilişi üçün tez geri çəkilməli və bu vəziy-yətdə dodaqların bir-birinə sıxılması ilə /b/ fonemini tələffüz etməlidir. Belə çətinlikdən çıxmaq üçün ən asan yol /n/ foneminin /m/ foneminə çevrilməsidir. Dil də bu çıxış yolundan uğurla istifadə edir. Ona görə ki, /m/ və /b/ səslərinin hər ikisinin artikulyasiyası dodaqların kipləşməsi ilə formalaşır:

/ze bəs gənc kan ruz bərbad rəft,
şəb-e **şəmbe**-ra gənce əz yad rəft./

(Nizami, 1947: 21)

*(O gün çoxlu xəzinənin bada getməsindən,*
***Şənbə*** *gecəsi Gəncəni yaddan çıxardı )* (Nizami, 1983: 443)

/ço kuh-e ahənin ze cay **combid**,
zəmin qofti ke sər ta pay **combid./**

(Nizami, 1321: 161)

*(Dəmir dağ kimi yerindən hərəkət edəndə,*
*Sanki yer başdan-ayağa lərzəyə gəldi.)*

Diqqət etmək lazımdır ki, Nizami mətnləri oxunarkən, qrafika ilə yanaşı tələffüz, deyiliş qanunlarına, üsluba da riayət edilsin.

**2. /b/→ /v/ fonem əvəzlənməsi**

"Xəmsə" məsnəvilərində "yazmaq" feilinin iki qrafik variantı statistik baxımdan təxminən bir-birinə yaxın saylarda işlənmişdir. Belə ki, məsnəvi mətnlərində /nebeştən/- "yazmaq" lekseminin /b/ samiti ilə yazılması 24 dəfə; /v/ samiti ilə, yəni /neveştən/ ilə yazılması isə 21 dəfə təkrar olmuş, işlənmişdir. Bu da həmin leksemlərin Nizami dövründə hələ də orta fars dilində olduğu kimi, yəni /p/ ilə yazılan qrafik variantının daha işlək olduğu kimi bir nəticəyə gəlməyimizə yardımçı olur.

Bildiyimiz kimi, farsların özlərinin artikulyasiya məxrəclərinə uyğun, Orta fars dilində mövcud olmuş dörd hərf ərəb əlifbasını qəbul etdikləri zaman nöqtəsiz, sərkeşsiz yazılırdı. Yəni "pe" /p/ samiti "be" /b/ hərfi ilə; "je" / j/- "ze" /z/ ilə; "çe" /ç/ hərfi "cim" /c/ kimi; "gaf" /g/ "kaf" /k/ hərfi ilə qeyd olunurdu. Əlyazmaların qədim nüsxələrinə müraciət etdikdə dediklərimizi aydın şəkildə müşahidə edə bilərik.

Məhz sadaladığımız faktlarla əlaqədar əlifbanın törətdiyi müxtəlif orfoqrafik, orfoepik qarışıqlığa görə qədim əlyazma nüsxələrinin düzgün oxunuşu tədqiqatçıdan kamil savad, mükəmməl bilik və təcrübə tələb edir. Bu səbəbdən klassik əsərlərin, bədii irs nümunələrinin tənqidi mətnini hazırlayan alim və tədqiqatçıların üzərinə düşən zəhmət və məsuliyyətin həcmi təsəvvür edildiyindən daha çoxdur. Məhz bu səbəbdən bəşəriyyətin maddi-mənəvi sərvəti, insanlığın əxlaq kodeksi sayılan Nizami və başqa klassiklərimizin əsərlərinin tənqidi mətnlərini ərsəyə gətirən, bütün şüurlu həyatını bu istiqamətdə sərf edən alimlərə, tədqiqatçılara, müəllimlərimizə sonsuz dərəcədə minnətdar olmalı, onların əziyyətlərini vaxtında və zamanında ən yüksək səviyyədə qiymətləndirməliyik.

Mövzudan yayınmayaraq, aşağıdakı beytlərdə "yazmaq" lekseminin fakültativ qrafik nümunəsi və tələffüzünü nümunələrdə izləyək:

/gər hərçe **nebeştei** beşuyi,
şuyəm dəhən əz zeyadequyi./

(Nizami, 1370: 350)

*(Sən öz **xətlərinin** hamısın yusan,*
*Ömürlük bağlaram ağzımı, inan)*

(Nizami, 1983: 33)

/Sekəndər be fərman-e u saz kərd,
hərir-e **neveşte** ze həm baz kərd./

(Nizami, 1947: 261)

*(İskəndər onun dediyinə əməl etdi,*
***Yazılmış** (şəkil çəkilmiş) ipəyi açdı )*

Bu beytlərin birincisində /nebeşte/ klassik, Orta fars dilinə uyğun, /neveşte/ – "yazı", "xətt" nisbətən sonrakı, həm də müasir fars dilınə uyğundur.

**3. /p/ → /f/ fonetik əvəzlənmələri:**

"Xəmsə"də iki variantlı qrafik nümunəyə malik /piruze/ və /firuze/- "firuzə" ilə /sepid/ və /sefid/- "ağ" sözlərinin statistik cəhətdən işlənmə tezliyini yoxlayarkən maraqlı nəticə əldə etdik. Həmin nəticəni aşağıdakı cədvəldə sizinlə bölüşək:

***Cədvəl***

| transkripsiya | piruz`e | firuz`e | sepid | sefid |
|---|---|---|---|---|
| Işlən.tezliyi | 27 | 15 | 27 | 10 |

Cədvəldən də göründüyü kimi hər iki leksemin Nizami dövrü üçün /p/ ilə yazılan variantı daha işlək olmuşdur. Maraqlıdır ki, illər keçdikcə işlək olan variantın yerini /f/ ilə yazılan qrafik variant tutmuşdur. Bu leksemlərin hər ikisi eyni ölçülü olduqlarından ustadın onları bəhrin, vəznin ölçüsü xatirinə işlətdiyi də istisna təşkil edir. Odur ki, bizcə həmin leksemin birincisi məhz o dövrlərdə, ikinci variantı isə daha sonralar işləklik statusu qazanmışdır. Müasir dildə isə, bildiyimiz kimi, bu sözlərin yalnız ikinci, yəni /firuze/ və /sefid/ variantları işlənir.

"Leyli və Məcnun" məsnəvisindən "Atasının Məcnuna nəsihəti" bölümündə şair deyir:

/doulət səbəb-e gerehqoşaist,
**piruze** xatəm-e xodaist ./

(Nizami, 1370: 403)

(Dövlət düyünləri açmaq üçündür,
Firuzə Allah möhürü olan üzükdür.) (Nizami, 1383: 104)

"Sirlər xəzinəsi"ndən aldığımız aşağıdakı beytdə "firuzə" sözünün fonetik dubleti işlənmişdir: .

/mərkəz-e in gonbəd-e **firuze** rəng,
bər to fəraxəst o əndişe təng. /

(Nizami, 1960: 206)

(Bu **firuzə** rəngli günbəzin mərkəzi,
Sənin üçün genişdir, düşüncə üçün isə dar) (Nizami, 1981: 162)

Aşağıda verdiyimiz beytlərdə isə /sepid/ - "ağ"sözündəki /p/ samitinin /f/ samiti ilə əvəzlənməsini, onların Nizami dövründə işlənməsini göstərən nümunələrdir:

/dər nomidi bəsi omid əst,
payan-e şəb-e seyah **sepid** əst./

(Nizami, 1370: 398)

*(Ümidsizlikdə saysız ümidlər var,
Zülmət gecənin sonu **ağ s**əhərdir )*

/ruz-e **sefid** an nə şəb-e dac bud,
bud şəb, əmma şəb-e me`rac bud./

(Nizami, 1960: 77)

*(O qaranlıq gecə deyil, **ağ** gündüz idi,
Gecə idi, ancaq ki, merac gecəsi idi )*

Belə bir araşdırmanı müasir fars dilində /f/ samiti ilə yazılan /fil/ – "fil" leksemi üçün apardıqda isə Nizami əsərlərində bu sözün "fe " ilə yazılan qrafik variantının bir dəfə də işlənmədiyinin şahidi olduq. Deməli, o dövrdə bu leksem yalnız "pe" hərfi ilə /pil / kimi yazılmış və tələffüz edilmişdir. Bu da onu göstərir ki, biz Nizami əsərləri vaxtılə klassik fars dilində olmuş, bu gün isə unudulmuş səslərin bərpası üçün misilsiz mənbədir deməklə heç də yanılmamışıq (Məmmədova, 2016: 46-52).

## Nəticə

Fars dilinin Fonetik Məhdudiyyət qanunu və ondan törəyən fonetik hadisələrin nümunələrinin hər birini ilk dəfə olaraq Nizami "Xəmsə"sinin beytləri daxilində bacardığımız qədər incələyib öyrəndik. Fonetik məhdudiyyət qanununun təsiri altında dil tələffüzü asanlaşdırmaq, çətinliklərdən uzaqlaşmaq üçün müxtəlif fonetik hadisələrdən geniş şəkildə istifadə edir. Bu tədqiqatımızda "Xəmsə"də samitlərin fonetik əvəzlənmələrini həm səs tellərinin iştirakına, həm də onların əmələgəlmə yerlərinə görə araşdırdıq. Samitlərin bu xüsusiyyətlərinin hər birini 3 yarımqrup daxilində tədqiqata cəlb edərək, fonetik baxımdan maraqlı sonuclar əldə etdik. Əminliklə demək olar ki, "Xəmsə"ni təşkil edən beytlər içərisində eləsini tapmaq mümkün deyildir ki, orada müasir dillə müqayisədə klassik dilin müəyyən bir və ya bir neçə fonetik, qrafik, leksik, morfoloji dəyişikliyi nəzərə çarpmamış olsun. Məhz buna görə də bu əsərlər dilçiliyin müxtəlif sahələri üzrə əsaslı şəkildə araşdırılmalı, tədqiqata cəlb edilməlidir.

## Ədəbiyyat

1. Axundov, A. (1984), Müasir Azərbaycan dilinin fonetikası, Bakı: Maarif nəşriyyatı, 390 s.
2. Bağeri, M. (2002), Tarix-e zəban-e farsi, Tehran: nəşr-e Qətre.
3. Bəhar, M.T. (1382), Səbkşenasi, celd I, Tehran: Moəssese-ye enteşarat-e Əmir
1. Kəbir.
4. Kristal, D.(2003), A Dictionery of Linguistics and Phonetics. Fifth Edition, Blackwell Publishing.
5. Dilçilk Ensiklopediyası (2008), II cild, prof. F. Veysəllinin müəllifliyi və redaktəsi ilə, Bakı: Mütərcim.
6. Əliyev, R (1981), Nizami "Sirlər xəzinəsi" Filoloji tərcümə, Bakı : Elm nəşriyyatı.
7. Fərhəng-e tousifi-ye avaşenasi (2004), Tərcome-ye fərhəng-e Devid Kristal əz zəban-e engelisi be farsi be qələm-e Məhəmməd Faez-e Xəlil Mirzayi, Tehran: moəssese-ye enteşarat-e Negah.
8. Gəncine-ye həkim Nezami Gəncəvi (1378), Ba təshih o həvaşi-ye Həsən Vəhid Dəstgerdi, be kuşeş-e Həsən Həmidiyan, Tehran: nəşr-e Qətre.
9. Neyyar Zəman, H. (1955), Müasir fars dilinin fonetikası haqqında bəzi qeydlər, Balı: ADU-nun Elmi əsərləri, № 11, s. 101-113

10. Məmmədova, Ə. (2007), Fars dilində vurğu, (eksperiment tədqiqat işi), Bakı: Nafta Press nəşriyyatı.
11. Məmmədova, Ə. (2016), Nizami əsərləri klassik fars dilinin bu gün unudulmuş səslərini bərpa etmək üçün misilsiz mənbədir, Nizami Gəncəvinin 875 illik yubileyinə həsr olunmuş "Nizami və dünya mədəniyyəti" mövzusunda Respublika konfransının materialları, səh 46 -53 , Bakı: "Elm və təhsil" nəşriyyatı.
12. Məmmədova, Ə. (2021), Nizami əsərlərində "xv" diqrafının ikili oxunuşu haradan qaynaqlanır. 715-726 s., Nizami Gəncəvi klassik və müasir tədqiqlərdə, Bakı: "Elm və təhsil" nəşriyyatı, 1028 s.
13. Məmmədova, Ə. (2021), Farsdilli ədəbiyyatda Azərbaycan üslubunun zirvəsi Nizami, International Conference. The great Azerbaijani poet Nizami Ganjavi and Eastern-Westrn literary-cultural heritage Desember 23-24,2021 Baku State University Baku, Azerbaijan Nizami Ganjavi 880 (book of abstrakcts).
14. Meşkotot Dini, M. (2007), Saxt-e avai-ye zəban-e farsi, Məşhəd: Daneşqah-e Ferdousi-ye Məşhəd.
15. Nezami, G. (1370), Xosrov və Şirin, dər ketab-e kolliyyat-e Xəmse-ye Nezami Gəncəvi, səh. 94-348; Tehran: Enteşarat-e Məhtab.
16. Nezami, G. (1370), Leyli vo Məcnun, dər ketab-e kolliyyat-e Xəmse-ye Nezami Gəncəvi, 350-496; Tehran: Enteşarat-e Məhtab.
17. Nezami, G. (1370), Həft peykər, dər ketab-e kolliyyat-e Xəmse-ye Nezami Gəncəvi, 497-695; Tehran: Enteşarat-e Məhtab.
18. Nezami, G.(1960), Məxzənül-əsrar, Tərtib dəhənde-ye mətn-e elmi-yo enteqadi Ə. Ə. Əlizade, Baku: Nəşriyyat-e Fərhengestan-e Olum-e Comhuri-ye şourəvi-ye Azərbaycan, 252 s.
19. Vurğun, S. (1983), Nizaminin "Leyli və Məcnun" məsnəvisinin poetik tərcüməsi, Bakı: Yazıçı nəşriyyatı.
20. Veysəlli, F. (1993), Fonetika və fonologiya məsələləri, Bakı: Maarif nəşriyyatı.

Göndərildi: 13.06. 2022 Qəbul edildi: 30.07. 2022

DOI: https://doi.org/10.36719/2663-4619/81/33-38

**Sevinc İslam qızı Əhmədova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
sevincasger@gmail.com

# DİLÇİLİKDƏ KONSEPT ANLAYIŞININ SEMANTİKASI

**Xülasə**

Konsept məfhumu insanın mental dünyasına, yəni mədəniyyətə və tarixə yaxındır və bu səbəbdən spesifik xarakter daşıyır. Konseptlər xalqın düşüncəsində yaşayan kollektiv irsdir, onun mənəvi mədəniyyətidir. Məhz bu səbəbdən kollektiv şüur konstantların, yəni daimi, yaxud uzun müddət mövcud olan konseptlərin qoruyucusu kimi çıxış edir. Linqvokulturologiyada konsept anlayışı kifayət qədər geniş sahəni əhatə edir. Konseptin tərkib hissələrinə dil vahidlərinin bütün leksik və qrammatik mənaları daxildir. Konseptin başlıca əlaməti onun mentallığı ilə əsaslandırılır. Hər bir mental xüsusiyyətə malik olan dəyərlər kimi, konseptlər də təxəyyül məhsuludur.

***Açar sözlər:*** *konsept, semantika.konseptual, koqnitiv, interpretasiya*

**Sevinj Islam Ahmadova**

## Semantics of concept understanding in linguistics

**Abstract**

"The study of concepts is one of the most urgent problems of modern linguistics and has developed in various scientific directions. Studying the methods of conceptual organization of knowledge in the language is considered one of the main problems of that issue. It is for this reason that the collective consciousness acts as a protector of constants, i.e. permanent or long-standing concepts. In linguistic culture, the concept covers a fairly wide area. The components of the concept include all the lexical and grammatical meanings of the language units. The main feature of the concept is its mentality. Concepts, like values with every mental quality, are a product of the imagination.

***Keywords***: *concept, semantics, conceptual, coqnitive , interpretation*

## Giriş

Konseptlərin tədqiqi müasir dilçiliyin ən aktual problemlərindən biridir vəmüxtəlif elmi istiqamətlərdə inkişaf etmişdir. Dildə biliyin konseptual təşkili üsullarının öyrənilməsi həmin məsələnin əsas problemlərindən sayılır. Konseptin bir tipi semantik konseptdir. Semantik təsəvvürlər mədəni təsəvvürdən mahiyyətcə sabitdir. Məhz bu səbəbdəndir ki,sözlərin mənaları mədəni dəyişmələrdə sabit qalır, dəqiq və sadə yolla sözlər arasındakı məna əlaqələrini açmağa nisbətən imkan tapır. Dilin qlobal mənaları konkret nitqdə bir çox hallarda birləşir, onları ayırmaq cəhdləri isə, adətən, süni görünür. Konseptin məna paradiqmasını təsvir etmək üçün üstün, aparıcı mənanın ardınca getmək lazım olur. Həmin aparıcı fikir də məna əlaqələrində, kontekstin başqa ifadələrlə birgə semantik cərgəsinin quruluşunda və başqa kontekstlərlə özünü göstərir. Lakin bu cür təmas nöqtələri tam təbiidir, çünki dil canlı bir sistem olaraq heç bir, hətta ən dəqiq sxemlə belə, ideal şəkildə təsvir edilə bilməz.

Bu cür təmas nöqtələrinin yaranmasına imkan yaradan ən qlobal mənaların xüsusiyyətləri haqqında nəticə çıxarmaq imkanını əldə etmək üçün mənaların təmas nöqtələrinin sxemini, cədvəlini qurmaq lazımdır. Cədvəl bir neçə konseptin materialı əsasında tərtib edilməlidir.

Konsepti, doğrudan da, tarixən təşəkkül tapmış, sözlə ifadə olunan qavram - dil bütövlüyü kimi anlamaq olar. Bu bütövlük həyatın əsas sahələrindən birinə aiddir və dil vasitələri ilə hərtərəfli dərk edilir, sosial və subyektiv dəyərləndirilir, müxtəlif yönləri ilə fəal şəkildə istifadə olunur".

O.A.Leontoviç konseptin linqvokulturoloji mahiyyətini belə açıqlayır:"Konseptlər linqvokulturoloji məkanın üzvlərinə bir-birini anlamağa kömək edir" Mədəni konsept kontekstin müxtəlif dərketmə tiplərində (bədii və elmi mətnlərdə) yaşayır. "Koqnitiv psixologiyanın semantika üçün dəyəri ondadır ki, o, konsept və kateqoriyaların tədqiqini və nəzəri modellərini hazırlamaqda mühüm əhəmiyyət kəsb edir. Mənanın konseptual tərəfini isə koqnitiv yanaşma öyrənir. Sözlərin necə və hansı yolla predmetləri

işarələməsini koqnitiv yanaşma öyrənir". A.A.Zaliznyak, İ.B.Levontina, A.D.Şmelyov haqlı olaraq qeyd edirlər ki, dünyanın dil mənzərəsi biliklərin məcmusu olub, ilk əvvəl mədəniyyəti daha geniş əks və interpretasiya etdirən dilin leksik-semantik sistemində toplanır və qorunur .

Müasir dövrümüzdə "konseptosfera" anlayışı elmdə işlək termin kimi qəbul olunmuşdur. D.S.Lixaçovun fikrincə isə, "Dilin konseptosferası özü mahiyyəti etibarilə mədəniyyətin konseptosferasıdır" (Lixacov,1993:7).

Semantik təsəvvürlər mədəni təsəvvürdən mahiyyətcə sabitdir. Məhz bu səbəbdəndir ki, sözlərin mənaları mədəni dəyişmələrdə sabit qalır, dəqiq və sadə yolla sözlər arasındakı məna əlaqələrini açmağa nisbətən imkan tapır. Ailədəki yaşlı adam reallığı ümumiləşdirilmiş şəkildə, anlayışlarla dərk edirsə, uşaq təsəvvürlərlə qavrayır.

Təsəvvürlərdə dil işarələrinin "hiss olunan təbiətinin" gerçək əlamətləri, əlaqələri, münasibətləri əks olunur. Ailədə uşaq təsəvvürü əsasında dil işarəsinin əlamətləri ilə real əlaqə və münasibətlərin uyğunluğu müəyyənləşdirilir. Dilin qlobal mənaları konkret nitqdə bir çox hallarda birləşir, onları ayırmaq cəhdləri isə, adətən, süni görünür. Konseptin məna paradiqmasını təsvir etmək üçün üstün, aparıcı mənanın ardınca getmək lazım olur. Həmin aparıcı fikir də məna əlaqələrində, kontekstin başqa ifadələrlə birgə semantik cərgəsinin quruluşunda və başqa kontekstlərlə özünü göstərir. Lakin bu cür təmas nöqtələri tam təbiidir, çünki dil canlı bir sistem olaraq heç bir, hətta ən dəqiq sxemlə belə, ideal şəkildə təsvir edilə bilməz.

Bu cür təmas nöqtələrinin yaranmasına imkan yaradan ən qlobal mənaların xüsusiyyətləri haqqında nəticə çıxarmaq imkanını əldə etmək üçün mənaların təmas nöqtələrinin sxemini, cədvəlini qurmaq lazımdır. Cədvəl bir neçə konseptin materialı əsasında tərtib edilməlidir.

Beləliklə, konseptin xüsusi şəkildə təşkil edilmiş lüğət məqaləsi kimi təqdim olunmasını onun analitik təsvirinin kifayət qədət səmərəli üsulu hesab etmək mümkündür. Bu cür təqdimatın nəticəsində mətnlər korpusu yaranır. Həmin korpus tədqiqatın sonrakı mərhələsində lüğət məqalələrinin ayrı-ayrı zonalarını (həmçinin konseptin ayrı-ayrı cəhətlərini) təhlil etməyə imkan verir. Dissertasiyanın ikinci fəslində də həmin üsul tətbiq olunub. Bü cür korpus, sözsüz ki, subyektivlikdən xali deyil. Bu da hər hansı bir ifadə üçün zonanın seçiminin birmənalı olmaması və külli miqdarda mətnlərin bir insan tərəfindən total şəkildə təhlil edilməsinin mümkünsüzlüyü ilə bağlıdır. Problem lüğət məqaləsini kağız daşıyıcıdan İnternetə keçirmə hesabına həll oluna bilər. Ondan əlavə, dilçilərin böyük bir qrupu üçün lüğət məqaləsini genişləndirmək, ona əlavələr etmək imkanı yaradılmalıdır ki, həmkarların təqdim etdiyi variantlar kollektiv şəkildə qiymətləndirilə bilsin.Dilçiliyin müasir koqnitiv paradiqması bir neçə anlayışı aktuallaşdırdı, özü də ənənəvi anlayış və terminlərin aktuallaşması çox zaman onların yenidən idrakı və dərki ilə müşayiət olunur. Bu cür paradiqmatik yenidən dərk, ilk növbədə, *konsept* terminınə aiddir. Bu terminə müasir tədqiqatlarda tez-tez rast gəlinir, onu yeni bir anlayış kimi görmək mümkün olmasa da, birmənalı qəbul etmək də kifayət qədər çətindir. XX əsrin əvvəllərində yaşamış rus filosofu S.A.Askoldov "Konsept və söz" adlı məqaləsinin lap əvvəlində yazır: "Ümumi konsept və anlayışların təbiəti məsələsi - universalilərin orta əsrlər terminologiyasına görə - növbədə gözləyən, ancaq öz mərkəzi maddəsi etibarilə, demək olar ki, toxunulmamış köhnə məsələdir" (Askoldov,1928:28-44).

S.A. Askoldovun istifadə etdiyi terminologiyanın özündən belə görünür ki, burada bu gün anlayış olaraq belə adlandırılması qəbul edilən intellektual fenomendən söhbət gedir. Özü də ki, verilən fraqmentdəki kimi hər hansı və ya ümumi anlayışdan deyil, məntiqi bir kateqoriya kimi sadəcə anlayışdan bəhs edilir. Linqvistikada bu məntiqi kateqoriya siqnifikata və ya intensionala uyğun gəlir. Məsələn,"intensional – söz və ya terminin daxili məzmununu,onun siqnifikasiyasını təşkil edən keyfiyyət və ya xassədir" (Askoldov,1928:35). Elə oradaca siqnifikasiya "sözün konkret dil situasiyalarında istifadə edilən zaman qazandığı mənadan, yəni onun nominasiyasından fərqli dil vahidi kimi sözə məxsus məna" kimi müəyyən edilir (Askoldov,1928: 26)

S.D.Katsnelson deyirdi ki, sözün leksik mənasının konseptual nüvəsi əşya haqqında anlayışı təşkil edir. Deməli, linqvistikada məna məntiqi kateqoriya kimi *siqnifikat* və ya *intensiona*l terminləri ilə işarə edilir. Bütün bu hallarda predmetləri vahid sinifdə birləşdirən və onları eyni sözlə adlandırmağa imkan verən mühüm məna əlamətlərindən söhbət gedir. S.D.Katsnelson yazırdı: "Leksik anlayışlar kimi leksik mənalar da, özünəməxsus zəka "konsentrat"ları, ətraf mühitin müəyyən fraqmentləri və tərəfləri haqqında insan biliklərinin toplusudur. Anlayışlar kimi sözlərin də mənaları reallığın spesifik əks olunma formasına – ümumiləşmə və mücərrədləşməyə əsaslanır,(Kantsnelson,1986:298) Beləliklə, sözün mənası siqnifikat

müstəvisində məntiqi və intellektual kateqoriya kimi anlayışla eyniləşdirilir. Daha sonra o, məna və anlayışı bir-birindən ayırmağa çalışaraq aşağıdakıları yazır: "Tədqiqatçıların bu məsələ barədə fikirləri kəskin şəkildə fərqlənir. Onlardan bəziləri leksik məna və ya ən azından onun konseptual "özeyini" anlayışla eyniləşdirməyi mümkün hesab edir,(Kançelson,1986:298) S.D.Katsnelson göstərir ki, birincilər məna və anlayışın yeganə fərqini mənanın emosional-ekspressiv və üslubi çalarlara malik olmasında görür, İkincilər prinsip etibarilə dil faktları ilə məntiq faktlarını eyniləşdirməyin doğruluğunu inkar edir. Bizim üçün mühüm olan cəhət isə S.D. Katsnelsonun konseptual özək ifadəsindən istifadə etməsidir. Daha sonra alim bir sözün müxtəlif vahidlərin çoxluğunu işarə edə bilməsini göstərən anlayışın məzmununu nəzərdə tutaraq konseptual məzmun və konseptual nüvə kimi terminoloji birləşmələrdən istifadə edir. Nüvə anlayışının universal olmasına baxmayaraq, nə olursa olsun, müxtəlif dillərdə sözün mənasının fərqləndiyindən bəhs edərkən o, ayrı-ayrı dillərin leksik-semantik sisteminə daxil olma amilini nəzərdə tutur. Dil sistemi və bütöv sistem daxilində başqa sözlərlə unikal əlaqələr ümumi universal anlayış nüvəsi daxilində müxtəlif dillərin fərqini müəyyən edir. Bütün bu hallarda O, anlayışın məzmununu nəzərdə tutur.

Müasir linqvistik terminşünaslıq nöqteyi-nəzərindən S.D.Katsnelsonun müddəası müəyyən ziddiyyətə malikdir, çünki bu gün "konsept nüvəsi" beynimizdə konseptlə, anlayış məzmunu isə anlayış, siqnifikat, intensionalla assosiasiya olunur. Buradan belə nəticəyə gəlmək olar ki, hələ S.D.Katsnelsonda konsept, konseptləşmə, konseptual anlayışları məntiqi kateqoriya kimi anlayış haqqında təsəvvürlərlə əlaqədar idi.

Deməli, sözün leksik mənasının konseptual nüvəsindən bəhs edərkən əşyaların mühüm əlamətlərinin məcmusunu nəzərdə tuturdu. Bu əlamətlər onları yeganə məntiqi sinifdə birləşdirir və bütün bu əşyaların eyni sözlə adlanmasına səbəb olurdu. Məsələn, dünyadakı bütün qaykalar "bolta keçirilmək üçün vint rezbası formasında kəsilmiş dəlikli detallardır" (Kantsnelson,1986:27).

Beləliklə, "dəlik" və "vint kəsiyi" ölçüsündən və hazırlanma materialından asılı olmayaraq bütün mövcud qaykaların əsas əlamətlərini daşıyır. Qaykalar haqqında anlayış da rus dilindəki гайка sözünün leksik mənasının siqnifikatını və ya S.D.Katsnelsona görə, leksik mənanın konseptual nüvəsini təşkil edir.

Müasir koqnitiv dilçilikdə konsept termini anlayış termini ilə eyniyyət təşkil etmir. Əgər anlayış öz məzmununu dəyişməyərək, bu gün də terminoloji mənada bütün əşyalar sinfinə aid edilən mühüm əlamətlərin məcmusunu bildirirsə, konsept xalqın bu və ya digər fenomen haqqındakı mədəni və tarixi-mədəni təsəvvürləri ilə əlaqələnməyə başlayıb.Məhz buna görə də konsept milli mentalitetin vacib fraqmentinə çevrilir.Hesab edilir ki,konseptlər (konsept məzmunu) tamamən (qalıqsız) reallaşa, dildə təmsil oluna bilməz.Konseptual məzmunun hansısa qalığı ifadə edilməmiş qalacaqdır.O, eyni dilin və mədəniyyətin daşıyıcılarını emosiyalar, əşyaların dərindən qəbul edilməsi, o cümlədən dünyaya münasibət səviyyəsində birləşdirir.

Əgər bu gün konsept haqqında məlum olan hər şeyi toplayıb nəticə çıxarmağa çalışsaq, iddia etmək olar ki, konsept anlayışdan (məntiqi kateqoriya kimi) sözün ifadə etdiyi fenomen haqqındakı milli-mədəni təsəvvürlərin özünəməxsusluğu ilə fərqlənir. Leksik işarə olan söz bu halda konseptə adekvat deyil və onun məzmununu təmsil etmir, onu yalnızca adlandırır və işarə kimi əvəz edir, onun haqqında siqnal verir. Məsələn, ingilis dilində *guest* sözünün leksik mənası rus dilində гость sözünün leksik mənasına uyğundur və hər iki sözün leksik mənaları Azərbaycan dilindəki qonaq sözü ilə eyniyyət təşkil edir. Hər üç halda "qonaq" anlayışından söhbət gedir. Bu sözün tərifi aşağıdakı tezisə bərabərdir: "kimisə görməyə gələn, kimisə görmək istəyən" (Kantsnelson,1986:76).

Artıq qeyd etdiyimiz kimi, sözlərin leksik mənasının nüvəsini təşkil edən şey əşya haqqındakı anlayışdır. Məntiqi və universal kateqoriya olan anlayış dildən dilə dəyişmir. Deməli, göstərilən sözlər ekvivalent olub eyni şeyi ifadə edir.

Lakin buna baxmayaraq, *guest*, *гость* və *qonaq* müxtəlif konseptual mənaları daşıyır. Daha dəqiq desək, onlar ingilis, rus və azərbaycanlıların kollektiv şüurunda aktiv olan "qonaq" konseptinin açarları, semiotik siqnalları qismində çıxış edir. Konseptin məzmununu müəyyən edən amillər isə ingilis və azərbaycanlıların qonağın nə olması, onu necə qəbul etmək, qonaq evdə ikən nəyi etmək olar, nəyi etmək lazımdır və s.suallarına cavab verən və tarixən formalaşan stereotip standartlardır. Təbiidir ki, belə informasiya dilin daşıyıcılarının şüurunda çox böyük məna yükünə malikdir. Bu informasiya haqqındakı bilikləri isə yalnız dildən almaq olar, bu informasiya dildə kodlaşmışdır və dildə qorunur. Bu şəkildə xalqın təsəvvüründəki dünyanın dil mənzərəsində olan bu və ya digər konsent haqqında təsəvvür

yaratmağa çalışsaq, leksik vahidlərdən başlayaraq, mətnlərə, bütöv semantik-struktur komplekslərə qədər onun dildəki reprezentasiyasının bütün hallarını öyrənmək zəruri olacaq.

Müasir dilçilik elminin inkişafı kontekstində bədii mətnin linqvokulturologiya nöqteyi-nəzərindən öyrənilməsi probleminə maraq artır. Linqvokulturologiya mürəkkəb elmi sahədir dilçilik, mədəniyyətşünaslıq, etnolinqvistika və sosiolinqvistikanın kəsişməsində yaranan biliklər bu gün öz inkişafının zirvəsindədir.

Linqvokulturologiya dilçilik və regionşünaslıq qarşılıqlı əlaqəlidir və belə hesab edir ki, bu, mədəniyyətlərarası ünsiyyət nəzəriyyəsinin bir qoludur. Bir sıra elm adamları da belə hesab edirlər ki, linqvokulturologiyanın formalaşmasının əsasını koqnitiv dilçilik çərçivəsində inkişaf edən linqvopsixoloji istiqamət təşkil edib ki, onun da əsas mövqeyi "dil məlumatlarını artıq mövcud olanlarla birləşdirmək və əlaqələndirmək zərurətindən ibarətdir. sensorimotor, sensor qavra yış haqqında başqa elmlərdən məlumdur.

Bir çox tədqiqatçılar - E.S.Kubryakova, N.F.Alefirenko, N.N.Boldırev, V.İ.Karasik və başqaları linqvokulturologiya ilə koqnitiv dilçiliyin sıx əlaqəsini vurğulayırlar Biz bir çox mütəxəssislərin fikrilə razıyıq ki, koqnitiv dilçilik və linqvokulturologiya bir-biri ilə sıx bağlıdır və eyni koqnitiv istiqamətdə inkişaf edir. Koqnitiv dilçilik və linqvokulturologiyanın həm oxşar, həm də fərqli cəhətləri var. Oxşarlıq dilin öyrənilməsinə, dildə insan amilinin öyrənilməsinə inteqrativ yanaşmanın, həmçinin "konsepsiya" və "dünyanın konseptual mənzərəsi" anlayışlarının mövcudluğu ilə müəyyən edilir. Linqvokulturologiyanın səciyyəvi cəhəti onun "iki müxtəlif kodun – dil və mədəniyyətin qarşılıqlı təsiri nəticəsində formalaşan linqvistik işarələrin mədəni semantikasının öyrənilməsinə" yönəldilməsidir. Bu baxımdan bədii mətnin milli-mədəni xüsusiyyəti böyük əhəmiyyət kəsb edir. İstər "sahə", istərsə də, "konsept" anlayışlarının psixolinqvistik və etnoliqvistik əsaslarından bəhs ederkən bir dilin materiallarını digər dillərin materialları ilə müqaisə etdikdə maraqlı məqamlar ortaya çıxır və həmin cəhətlərin koqnitiv plandan təhlil olunması daha mükəmməl; o cümlədən maraqlı nəticələrə gəlməyə imkan yaradır. Hər bir halda ailənin ayrıcı bir institut olduğu ən müxtılif sosial toplumlarda,cəmiyyətlərdə müşahidə edilir.Konsept dil vasitələrinin cəmində reallaşır. Həmin cəmə konseptin adı və məzmununu dəqiq, yaxud vasitəli yolla izah edən (eksplisit), dəqiqləşdirən və inkişaf etdirən dil vasitələri aid edilir. "Fəlsəfi qrammatistlər səciyyəvi olaraq belə bir fikri əsas tuturdular ki,dillər öz strukturlarında az fərqlənir, halbuki üst qat təzahürlərində böyük müxtəliflik mümkündür"(Xomski,2006: 134). Şübhəsiz, N.Xomskinin bu fikri dilə aid olsa da, konseptə də şamil edilə bilər. Üst qat təzahürləri dedikdə, konseptin dil vasitələri ilə ifadəsi kimi başa düşülür. Bu səbəbdən tədqiqatlarda konseptual təhlil metodu tətbiq edilir.Həmin metodun əsas məqsədi:1) mədəniyyətşünaslıq baxımından əhəmiyyət kəsb edən paradiqmanın və onların konsept,yəni mental sahəsini quran komponentlərin üzə çıxarılmasından; 2) konseptin məzmununun: sözün,adın sinonimini və tərifini vermək, frazeologizmlərin, zərbi-məsəllərin, aforizmlərin, deyimlərin, cümlələrin, mülahizələrin struktur və semantik modellərinin, nəhayət, konseptin təqdim olunduğu mətnlərin məzmununun müəyyən edilməsindən ibarətdir.Sadalanan reprezentasiyalar bu və ya digər konseptlərin məzmunu haqqında biliklərin mənbəyidir.

Y.S.Stepanov öz tədqiqatlarında ayrı-ayrı konseptlərin tarixinin öyrənilməsinin vacibliyini qeyd edirdi. "Konseptin məzmunu çoxəsrlik inkişaf tarixinə baxmayaraq, kifayət qədər sabitdir. Bununla bağlı dilçilikdə konseptlərin sinxronik və diaxronik təsvir metodu tətbiq edilir. Konseptin "laylı" strukturu da məhz tarixi dəyişikliklərlə şərtlənir. Bu, tam məntiqidir, çünki hər bir tarixi mərhələdə çoxsaylı mənaların biri aktual olur" (Stepanov,2005:40).

Söz konseptin formal təmsilçisidir. Buna görə də konseptin və onun tərkib hissələrinin təhlili söz strukturunun, yəni onun komponentlərinin təhlilindən başlayır. Dilin məna vahidlərinin məzmun aspektinin təhlili struktur-semantika çərçivəsində işlənib hazırlanır və bu işin məqsədi mənaları minimum semantik hissələrəbölməkdən ibarətdir. Komponent təhlililüğət təfsirlərinin əsasında yerinə yetirildiyi zaman tədqiq edilən dil vahidi üçün səciyyəvi olan diferensial əlamətlər üzə çıxır.

Qeyd etmək lazımdır ki, dilçilik elmində konseptlərin öyrənilməsinin başqa metodları da mövcuddur. Məsələn, S.Y.Nikitina və Y.Bartminski "mədəniyyət" məntlərində "ayrılmış tərif" (Nikitinin terminologiyası) və "koqnitiv tərif" (Bartminskinin terminologiyası) metodundan istifadə edirdilər. Həmin metodlara uyğun olaraq, konsept "müntəzəm semantik əlaqələr siyahısının tərtib edilməsi" kimi təqdim

olunur və qeyd edilir ki, həmin semantik əlaqələr konsept-sözün dərk edilməsi üçün çox böyük əhəmiyyət kəsb edir.

Bu da konseptin valentlikləri haqqında fikir söyləməyə imkan verir. Daxili formanın üzə çıxarılması konsept təhlilinin başqa istiqaməti hesab olunur. Məsələn, Y.Stepanov konseptin təhlilində onun bilavasitə hərfi mənasını axtarmağı əks vacib hesab edir. O, qeyd edir ki, daxili forma,adətən, dərk edilmir və termin sözünün daxili və zahiri formasında olunur.

L.O.Çerneyko başqa bir metod təklif edir. Onun fikrincə, konsept strukturu arxetipləri, dərin mənanı reallaşdıran abstraksiya səviyyəsini özündə əks etdirir. Bu metod abstrakt (mücərrəd) adın geştalt strukturunun təhlilindən ibarətdir. “Həmin metodun tətbiqi üçün zəmini, ilkin şəraiti konseptin sublogik (subməntiqi)əsası yaradır, çünki onun məzmununa sadə (fikir, inam və b. əsaslanan) məfhumlar daxil edilir və həmin məzmun birləşmələrdə özünü nümayiş etdirən adın (sözün) konnotativ elementlərinin hamısını əhatə edir”(Çernyakov,2017:14).

Tədqiqatın mənbələrini və materiallarını dram əsərlərindən dialoqlar, məişət söhbətləri, publisistik mətnlər, zərbi-məsəllər və xalqın müdrikliyini, fəlsəfəsini özündə əks etdirən deyimlər təşkil edir. Yəni geştaltların üzə çıxarılması mücərrəd adın konseptual təhlili taktikası deməkdir. Onun strategiyası isə dil biliklərinin strukturunu təsvir etməkdən, yəni dil daşıyıcılarının adlarda gizli qalan və birləşmələrdə üzə çıxan təsəvvürlərindən, işarə məzmununun obrazlarının açıqlanmasından ibarətdir.

Konseptin öyrənilməsindən söhbət açarkən qeyd etməliyik ki, onun tədqiqi çoxşaxəli təsviri metodlar kompleksinin tətbiq edilməsi nəticəsində mümkündür. Onların arasında dilçilik, linqvo-mədəniyyətşünaslıq, kontent-təhlil, definisiya (tərif), kontekstoloji təhlil, kontrastiv (təzadlı) təhlil (yəni iki fərqli dilin müqayisə olunması), freym təhlili, psixologiyada və sosiologiyada tətbiq edilən açıq müsahibələr; eksperimental-koqnitiv dilçilik üsulları (burada materialın əsas mənbəyi şəklində dilin daşıyıcıları çıxış edir);mətnin linqvomədəniyyətşünaslıq üsulları və milli fəlsəfi kontekstinin təhlilini xüsusi qeyd etmək lazımdır.

Həmçinin qeyd etmək lazımdır ki, “konsept” termini Azərbaycan mədəniyyətşünaslığında və dilçilikdə müəyyən qədər işlənib, təhlil olunub. Lakin müxtəlif elm sahələrində bu termin ən müxtəlif məna və məzmun qazanır. “Konsept” termini bir neçə elmi istiqaməti – ilk növbədə, koqnitiv psixologiyanı və koqnitiv dilçiliyi əhatə edir. Adları çəkilən elm sahələri təfəkkür və şüur problemləri, informasiyanın qorunması və işlənməsi ilə, linqvomədəniyyətşünaslıqla məşğul olur və onların təməl kateqoriyaları və postulatları ilə əmələ gələn nəzəriyyə çərçivəsində müəyyən edilir və dəqiqləşir.

Lakin “konsept”adının əlaqədə olduğu mental obyektlər ümumi, yaxud spesifik soy əlamətlərinə malik deyil. İdeal sahəyə mənsub olmaq məna və məzmunun, ideya və fikrin, məfhum və təsəvvürün, obraz və b. xüsusiyyətidir və onlar oxşardır.

Müasir humanitar elmdə “konsept” sözünü ilk dəfə rus mütəfəkkiri S.A. Askoldov (1870-1945) tətbiq etmişdir. Orta əsrlər dövrünün nominalistləri kimi, S.A.Askoldov da “fərdi təsəvvürü bütün soy həcminin əvəzi” hesab edir. Lakin qədim alimlərdən fərqli olaraq, S.A.Askoldov konsepti fərdi təssəvvürlə eyniləşdirmir və onda “ümumilik, oxşarlıq” görür. Onun fikrincə,“konsept - düşüncənin törəməsidir, o da düşüncə prosesində eyni cərgədən olan çoxsaylı əşyaları əvəz edir”(Askoldov,1928:33).

Koqnitiv dilçilik çərçivəsində “konsept” dedikdə, insan psixikasında əks edilmiş yaddaş vahidini, mental leksikonu nəzərdə tuturuq. Z.D.Popova, İ.A.Sternin konsepti “qlobal düşüncə vahidi kimi” (müəyyən) tərif edir. Bu mahiyyət insan şüurunda insanın konkret fəaliyyəti, insanın şüurunda artıq mövcud olan başqa konseptlərlə düşüncə “əməliyyatları” (operasiyaları) əsasında formalaşır. Bu cür əməliyyatlar yeni konseptlərin yaranmasına səbəb ola bilər. Beləliklə, dil insan şüurunda konseptlərin formalaşma yollarından biridir.

Konsept - insanın mental dünyasında mədəniyyətin əsas özəyidir. Konseptin strukturu üçqatlıdır: “1. əsas, aktual əlamət; 2. aktual, tarixi əhəmiyyət kəsbetməyən əlavə, yaxud bir neçə əlavə, “passiv” əlamət; 3. zahiri, şifahi formada təqdim edilən, adətən, tam dərk edilməyən daxili forma. Müasir tədqiqatlarda mədəni konseptlər kollektiv şüurun dildə əks edilən çoxşaxəli məna formaları kimi düşünülür”.

Son illər aparılan yeni tədqiqatlarda konseptin ən fərqli təsnifatları təqdim olunur. Həmin təsnifatların birinin müəllifi V.İ.Karasikdir.O yazır ki, məzmun baxımından konseptlərin hamısını parametrik və qeyri-parametrik mental törəmə (forma) kimi bir-birinə qarşı qoymaq mümkündür. Parametrik konseptlər təsnifat kateqoriyalar kimi çıxış edir və “məkan”, “zaman”, “kəmiyyət”,“keyfiyyət”kimi kateqoriyaların

müqayisəsi üçün tətbiq edilir. İkinci, qeyri-parametrik mental formalara konkret məzmun daşıyan konseptlər aid edilir.

Konseptlərin kateqoriya statuslarının ən mühüm əlamətlərindən biri onların müstəqil xarakteri və binar əksliyə malik olmasıdır, həmin binar əkslik də konseptin konstitutiv əlaməti kimi fəaliyyət göstərir.Qeyri-parametrik konseptləri tənzimləyici və qeyri-tənzimləyici qruplara bölmək mümkündür. Birinci qrupa məzmununda əsas yeri dəyər konsepti tutan mental formalar daxildir.

Qeyri-tənzimləyici konseptlər qrupu (sinfi) özünün qeyri-adiliyi ilə seçilir. Linqvistik ədəbiyyatda təklif edilən mental vahidlər təsnifatı linqvistik və koqnitiv-psixoloji meyarlar əsasında qurulur."Yəni şəkillərlə,sxemlərlə, hiperonimlərlə və konseptlərin digər növləri ilə yanaşı, linqvo-mədəni tipajı ayırmaq mümkündür".

## Nəticə

Dilçiliyin müasir koqnitiv paradiqması bir neçə anlayışı aktuallaşdırdı, özü də ənənəvi anlayış və terminlərin aktuallaşması çox zaman onların yenidən idrakı və dərki ilə müşayiət olunur. Bu cür paradiqmatik yenidən dərk, ilk növbədə, *konsept* terminінə aiddir. Bu terminə müasir tədqiqatlarda tez-tez rast gəlinir, onu yeni bir anlayış kimi görmək mümkün olmasa da, birmənalı qəbul etmək də kifayət qədər çətindir. Əgər bu gün konsept haqqında məlum olan hər şeyi toplayıb nəticə çıxarmağa çalışsaq, iddia etmək olar ki, konsept anlayışdan (məntiqi kateqoriya kimi) sözün ifadə etdiyi fenomen haqqındakı milli-mədəni təsəvvürlərin özünəməxsusluğu ilə fərqlənir. Leksik işarə olan söz bu halda konseptə adekvat deyil və onun məzmununu təmsil etmir, onu yalnızca adlandırır və işarə kimi əvəz edir, onun haqqında siqnal verir.

## Ədəbiyyat

1. Askoldov, S.A. (1928), Konsepsiya və söz, Leninqrad: Rus nitqi. L. V. Şerba tərəfindən redaktə edilən kolleksiyalar. Yeni seriya. II.
2. Cherneiko, L.O. (2007), Məna necə yaranır: Bədii mətnin semantik quruluşu və onun modelləşdirilməsinin linqvistik prinsipləri, L.O. Cherneiko. Moskva: Gnosis.
3. Xomski, N. (2006), Dil və təfəkkür, Bakı: Kitab aləmi.
4. Karasik, V.I. (2001), Linqvokulturologiyanın kateqoriyaları haqqında, Volqoqrad: Dilçi şəxsiyyət: kommunikativ fəaliyyət problemləri.
5. Katsnelson, S.D.(1986),Ümumi və tipoloji dilçilik, Leninqrad: Elm, 298 s.
6. Bartminski, E. (2005), Dünyanın dil obrazı: etnolinqvistika üzrə esselər: [tərcümə. yerdən.], [tərtib. və cavab. red. S. M. Tolstaya]. - Moskva: İndrik..
7. Kuskovskaya, S.F. (1992), İngilis dilində yazışmalarla rus atalar sözləri və məsəllər, S.F. Kuskovskaya. Minsk: Ali məktəb.
8. Leontoviç, O.A. (2003), Volqoqrad: Dəyişiklik.
9. Lixaçev, D.S., O. Leontoviç. (2018), Rusiya və ABŞ: Mədəniyyətlərarası ünsiyyətə giriş: dərslik, Rus dilinin konseptual sahəsi, Moskva: Elmlər Akademiyasının materialları. Ədəbiyyat və dil silsiləsi, 1993. V.52, No 1, s.3-9.
10. Stepanov, Y.S. (2005), Müasir dilçiliyin metod və prinsipləri, Moskva: Redaksiya URSS.
11. Teliya, V.N. (2002), Linqvokulturologiya, V.N. Teliya. Moskva: Məktəb "Rus mədəniyyətinin dilləri".
12. Veysəlli, F.Y. (2003), Dilçiliyin əsasları, Bakı: Mütərcim.
13. Zaliznyak, A.A. (2005), Rus dilinin dünya mənzərəsinin əsas fikirləri, A.A.Zaliznyak, I.B.Levontina, A.D.Şmelev. Moskva: Slavyan mədəniyyətinin dilləri.

**Rəyçi: fil.ü.f.d. Səkinəxanım Vəliyeva**

Göndərildi: 28.06. 2022 Qəbul edildi: 27.07. 2022

DOI: https://doi.org/10.36719/2663-4619/81/39-43

**Nərgiz Əhməd qızı Həsənova**
Bərdə şəhər 8№-li tam orta məktəb
müəllim.nergizhesenova1975@gmail.com

# İBTİDAİ SİNİFLƏRDƏ MİLLİ - MƏNƏVİ DƏYƏRLƏRİN AŞILANMASI

**Xülasə**

İbridai sinif dərsliklərində verilən bədii mətnlər, bədii parçalar kiçik yaşlı məktəblilərin əxlaq tərbiyəsində böyük rol oynayır və böyük əhəmiyyət kəsb edir. Kiçik yaşlı məktəblilərin tərbiyəsində bədii mətnlər (nağıl, rəvayət, dastanlardan parçalar, şeir, laylalar, bayatılar və tapmacalar) böyük tərbiyəvi təsir gücünə, əxlaqi keyfiyyətlər formlaşdırmaq qüvvəsinə malikdir. Sinif müəllimi bu əlverişli imkandan səmərəli istifadə etməlidir.

***Açar sözlər:*** *məktəblilər, əxlaq, mənəviyyat, dərslik, təhsil*

**Nargiz Ahmed Hasanova**

## Upbringing of national-spiritual values in primary schools

**Abstract**

Literary texts and literary pieces given in Hebrew textbooks play an important role in the moral education of young schoolchildren and are of great importance.In the education of young schoolchildren, literary texts (tales, legends, passages from epics, poems, lullabies, bayats and riddles) have a great educational effect, the power to form moral qualities.The class teacher should take advantage of this opportunity.

***Keywords:*** *schoolchildren, morals, spirituality, textbook, education*

## Giriş

İbtidai təhsil ümumtəhsil sisteminin ilk pilləsi olmaqla gələcək təhsilin əsasını qoyur.

Bu gün cəmiyyətimizə saf əqidəli, zəngin mənəviyyatlı, soykökünə, Azərbaycan xalqının azadlıq və demokratik ənənələrinə bağlı olan, xalqının mənəvi, mahiyyətcə milli, keyfiyyətcə humanist və mədəni sərvətlərinə əzmlə yiyələnən, onu qoruyan və daim inkişaf etdirən sağlam nəslin yetişdirilməsi çox vacibdir. Mənəvi tərbiyə üzrə səmərəli fəaliyyət eyni zamanda gənc nəslə, xüsusən kiçikyaşlı məktəblilərə , vətənpərvərlik, yoldaşlıq və dostluq, sadəlik və təvazökarlıq, yaxşılıq və xeyirxahlıq, böyüyə, müəllimə, valideynlərə, qadına hörmət, qayğı, düzlük və dözümlülük, ədalətlilik, məsuliyyət, intizam, şərəf, ləyaqət, vicdan, namus, etibarlılıq, sadiqlik, səbr və təmkinlilik, abır, həya, ismətlilik, həyalılıq, ədəb-ərkan, səxavətlilik, qonaqpərvərlik, ədalətlilik, igidlik, qəhrəmanlıq, mərdlik, mübarizlik, sözübütövlülük, sadiqlik, azərbaycançılıq, dövlətçilik, müdriklik, təbiətə sevgi, məhəbbət və qayğı və s. 100 –dən artıq mənəvi-əxlaqi keyfiyyətləri aşılayırlar.

*Vaxtilə böyük alim, mütəfəkkir Məhəmməd Nəsirəddin Tusi mənəvi-əxlaqi keyfiytyətləri aşağıdakı kimi 4 qrupda - hikmət, onun əksi olanları isə rəzalətlər adlandırmışdır: 1) Hikmət; 2) şücaət; 3) iffət; 4) ədalət. Tusi rəzalətləri isə yenə də 4 qrupda belə adlandırmışdır: 1) Avamlıq –hikmətin ziddi; 2) qorxaqlıq – şücaətin ziddi; 3) çılğınlıq –iffətin ziddi; 4) zülmkarlıq –ədalətin ziddi (Tusi, 1989: 17-18).*

Mənəvi tərbiyə kimi çətin, mürəkkəb, ziddiyyətli, lakin vacib və şərəfli vəzifələrin yerinə yetirilməsi, məhz ibtidai təhsil mərhələsində daha elmi şəkildə həyata keçirilir. Yeni insanın formalaşmasında dərin biliklərin, savadlılığın, habelə ideyalılığın möhkəm bünövrəsi, məhz bu mərhələdə qoyulur.

Məktəb illərində, ilk növbədə isə, ibtidai siniflərdə həm təlim və həm də sinifdənxaric tədbirlər prosesində kiçik yaşlı məktəblilərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi daim xüsusi diqqət mərkəzindədir. Kiçik yaşlı məktəbliləri milli – mənəvi, əxlaq tərbiyəsi ruhunda tərbiyə etmək üçün, ilk növbədə, onlara milli-mənəvi dəyərlərimizi, ana dilimizi, milli adət-ənənələrimizi, həyat tərzimizi dərindən mənimsətməliyik.

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev Azərbaycan Gənclərinin Birinci Umumrespublika Forumundakı nitqində demişdir: *"Xalqımızın tarixinin əsasını təşkil eləyən bütün*

*mərhələlərdə, keçmiş əsrlərdə də yüksək mənəviyyat olmuşdur. Keçmiş tariximizdən bizə qalan simaları bu gün dünyada məşhurlaşdıran və bizim üçün nümunə edən onların yüksək mənəviyyatıdır, yüksək amallarıdır... Gənclərimiz milli ruhda tərbiyə olunmalıdır, bizim milli- mənəvi dəyərlərimizin əsasında tərbiyələnməlidir. Gənclərimiz bizim tariximizi yaxşı bilməlidir, keçmişi yaxşı bilməlidir, dilimizi yaxşı bilməlidir, milli dəyərlərimizi yaxşı bilməlidir. Milli dəyərlərimizi, milli ənənələrimizi yaxşı bilməyən, tariximizi yaxşı bilməyən gənc vətənpərvər ola bilməz" (Əliyev, 1996:2).*

Ulu öndərimizin müdrik fikirlərindən irəli gələrək, yetişməkdə olan gənc nəslin milli-mənəvi ruhda tərbiyəsi, təlim və tərbiyə işlərinin milli zəmin üzərində qurulması, tariximizin, mədəniyyətimizin, pedaqoji fikrimizin, zəngin mənəvi irsimizin öyrənilməsi bu gün daha böyük aktuallıq kəsb edir.

Xalqın mövcudluğunun əsas göstəricisi olan milli-mənəvi dəyərlər onun ən qiymətli sərvətidir. Hər bir xalq milli mənəvi dəyərlər sisteminə malikdir. Bu milli-mənəvi dəyərlər bizim tariximiz, dilimiz, dinimiz, adət-ənənələrimiz, mentalitetimiz, mədəniyyətimiz, ədəbiyyat və incəsənətimizdir.

Milli- mənəvi dəyərlər insanı cəmiyyətdə hərtərəfli formalaşdıran, ümumi inkişafına, dünyagörüşünə, təhsilinə, mənəvi mədəniyyətinə istiqamət verən davranış qaydalarıdır. Bu qaydalar dünya sivilizasiyasının təməli qoyulandan yaranmağa başlamış və bu günı qədər davam edir. Milli- mənəvi dəyərlərin insanda formalaşması prosesində dünyada hər bir fərdin haqlarını, hüquqalarını, insansi keyfiyyətlərini daha dolğun ifadə edən xüsusiyyətlər yaranır.

Dünya xalqları arasında milli-mənəvi dəyərləri ilə tanınan Azərbaycan xalqı yaşatdığı və təbliğ etdiyi bəşəri ideyaları, adət-ənənələri, milli xüsusiyyətləri ilə özünəməxsus yer tutur.

Heydər Əliyev milli-mənəvi dəyərlərimizin öyrənilməsini, qorunub saxlanmasını və inkişaf etdirilməsini əsas vəzifələrdən biri kimi irəli sürürdü. Bunlarsız millət yoxdur. Bunları qoruyub saxlamış xalq isə həmişə müstəqillik yolu ilə getmək, müstəqilliyini qorumaq əzmindədir.

*...Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz Azərbaycançılığı - Azərbaycan dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıyıq* - deyən Heydər Əliyev Azərbaycançılığı milli bir ideologiya kimi irəli sürür, mədəniyyətimizi, mənəvi dəyərləri təkcə milli varlığımızın yox, həm də siyasi varlığımızın - dövlət quruculuğu prosesinin mühüm atributu kimi dəyərləndirirdi.

Ümummilli liderimiz, ulu öndər Heydər Əliyev ölkəyə rəhbərlik etdiyi bütün dövrlərdə, xüsusilə müstəqillik dövründə yetişən gənc nəslin milli-mənəvi dəyərlər əsasında tərbiyə edilməsini başlıca vəzifə kimi qarşımıza qoymuşdur. Dahi rəhbər Gənclərin Birinci Ümumrespublika Forumunda bu məsələyə xüsusi diqqət yetirərək demişdir: *"Bizim milli-mənəvi dəyərlərimiz əsrlər boyu xalqımızın fəaliyyətində formalaşmışdır. Milli-mənəvi dəyərləri olmayan millət həqiqi millət, həqiqi xalq ola bilməz" (Əliyev H.Ə, 1996:2).*

Bəli, xalqı, milləti millət edən onun milli - mənəvi dəyərləri, milli əxlaqıdır. Buna görə də, indi başlıca vəzifə xalqımızın milli adət-ənənələrini, milli əxlaqi və mənəvi dəyərlərini yaşadan, onu daha da inkişaf etdirən, onları gələcək nəsillərə ötürə bilən şəxsiyyətlər, vətəndaşlar ilk növbədə ailədən, məktəbəqədər təhsil müəssisələrindən başalayaraq, ibtidai siniflərdə və daha sonrakı illərdə daha da zənginləşdirilməli və təkmilləşdirilməlidir.

Məktəb təkcə bilik təlim müəssisəsi deyil, o həm də şagirdlərin inkişafını təmin edən tərbiyə, əxlaq, mənəviyyat məktəbidir.Burada uşaqlar geniş biliklər əldə etməklə yanaşı, hərtərəfli tərbiyə olunur, həyati estetik vərdişlərə, mədəni etik davranışlara, xəlqilik, millilik, vətənpərvərlik dəyərlərinə yiyələnirlər.

Milli- mənəvi dəyərlərimizdən biri dilimiz- Azərbaycan dili və deyə bilərik ki, milli mənəvi dəyərlərimizn ən başlıcası və ən birincisi hesab olunur. Azərbaycan dili bizim ana dilimizdir. Ana dilimizin inkişafında misilsiz rol oynayan, bu dilin dünya miqyasına çıxması üçün əlindən gələni edən Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev demişdir:*"Ana dilimiz bizim sərvətimizdir. Hər bir xalqın milliliyini, mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən onun dilidir. Dil böyük bir aləmdir. Hər bir xalq öz dili ilə yaranır, ancaq xalqın dilini yaşatmaq, inkişaf etdirmək və dünya mədəniyyəti səviyyəsinə çatdırmaq xalqın qabaqcıl adamlarının, elm, bilik xadimlərinin fəaliyyəti nəticəsində mümkün olur" (Əliyev, 1996:2).*

Bu gün də əsası Ulu Öndər tərəfindən qoyulan Təhsil İslahat Proqramı (*Əliyev, 1999:2),* ana dilinin inkişafına, onun qorunmasına və milli -mənəvi, əxlaqi dəyərlərin inkişafıa yönəlik Təhsil Qanunu (*Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu)*, "Azərbaycan Respublikasında təhsilin inkişafı

üzrə Dövlət Srategiyası" (*Əliyev , 2013:2)* haqqında ölkə Prezidenti cənab İlham Əliyevin sərəncamı və bunun yerinə yetirilməsi üçün strateji tədbirlər planının həyata keçirilməsi uğurla davam etdirilməkdədir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev dilimizə, milli adət-ənənələrimizə, mənəvi dəyərlərimizin təbliğinə, qədim tarixə malik mədəniyyətimizin tanıdılmasına daim böyük həssaslıqla yanaşır. Dövlət başçımızın 2004-cü il yanvarın 12-də imzaladığı "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında" Sərəncamı Azərbaycan dilinin saflaşdırılması və inkişafı istiqamətində çox mühüm addım olmuşdur.

**Əsas mətn**

Bu gün milli sərvətimiz, mənəvi varlığımızın və bütövlüyümüzün təcəssümü, təsdiqi olan ana dilimizi qorumaq, bütün gözəllikləri və incəlikləri ilə bu günün şagirdlərinə tədris edib öyrətmək fədakar müəllimlərimizin, xüsusilə ibtidai sinif müəllimlərinin əməyindən çox asılıdır. Şagirdlərimizdə ünsiyyət mədəniyyətini inkişaf etdirmək, onlarda nitq fəaliyyətinin müxtəlif növlərini - düşünmə, anlama, öyrənmə bacarıqlarını formalaşdırmaq və bu əsasda onlarda əxlaqi keyfiyyətlər aşılamaq müəllimlərimizin öhdəsinə düşən ən mühüm vəzifələrdəndir. Bu gün dilimizin incəlikləri, zənginliyi, məna gözəlliyi müasir tədris proqramları, yeni təlim metodalrı, pedaqoji texnologiyalar şagirdlərin dərin biliklər almasına, vətənpərvər, yüksək mənəviyyatlı şəxsiyyətlər yetişdirilıməsinə istiqamətlənmişdir.

*Kiçik yaşlı məktəblilərin şəxsiyyətinin formalaşmasına, xüsusilə əxlaq-mənəvi keyfiyyətlərinin inkişafına müxtəlif amillər təsir edir ki, bunların içərisində isə ibtidai sinif dərsliklərinin, xüsusilə Azərbaycan dili dərsliklərinin böyük rolu və əhəmiyyəti vardir (İsmayılov, 2013).*

Bu dərsliklərdə verilən bədii mətnlərin, bədii parçaların kiçik yaşlı məktəblilərin əxlaq tərbiyəsində böyük rolu və əhəmiyyəti olduğunu qeyd edərkən həmçinin uşaqlarda aşılıancaq əxlaqi keyfiyyətlərin ümumi şəkildə təsnifatı dəyərəli bir mənbələrdə belə göstərilmişdir:

*"Vətənpərvərlik, sadəlik və təvazökarlıq, düzlük və doğruçuluq, mərhəmət və qayğıkeşlik, əməksevərlik, böyüklərə hörmət, diqqətlilik və həssaslıq" (Hüseynzadə, 2021:145).*

Azərbaycan dili dərsliklərindən istifadə edərək ibtidai sinif şagirdlərinin milli- mənəvi dəyərlər əsasında tərbiyəsi ilə məşğul olmaq üçün sinif müəllimin əlində geniş imkanlar vardır. Nümunə üçün IV sinif Azərbaycan dili dərsliyinin bölmələrinə baxaq. Bu dərslikdə mətnlər 8 bölmə üzrə qruplaşdırılmışdır ki, onlar aşağıdakılardır:

1.Ailə və məktəb;
2. Niyə belə deyirik;
3 Əməksevərlik;
4.Yüz min niyə;
5. Dostluq;
6. Ana təbiət;
7. Əxlaqi dəyərlər;
8. Kainatın sirləri.

*Bu bölmələrdən 7 – ci bölmə bilavasitə əxlaq tərbiyəsi ilə bağlı olsa da digər bölmələrdə verilən mətnlərin hər birində şagirdlərdə əxlaqi- mənəvi keyfiyyətlər formalaşdırmaq üçün müəllimin əlində geniş imkan və yollar vardır (İsmayılov, 2010:75).*

Bu bölmələrdə verilən bədii parçalar uşaqların davranışı haqqında (Ailə və məktəb bölməsində), məmləkətimizin şəhərləri, yurdumuzun təbiət gözəllikləri, dağları, çayları, gölləri (Ana təbiət bölməsi), kainatda baş verən təbii hadisələrin sirri (Kainatın sirrləri bölməsi), nəcib insanlar, əxlaqi keyfiyyətlər (Əxlaqi dəyərlər bölməsi) barədə ətraflı söhbət açmalıdır.

İbtidai siniflərdə müəllimin bədii mətnlərin oxusu zamanı xalqımızın sülhsevərliyi, vətənəprvərliyi, comərdliyi, mübarizliyi, dövlətçiliyi, şərəf, ləyaqəti, namus və vicdan məsələlərini, dostluq və yoldaşlıq, sədaqətlilik, ədalətlilik və s. kimi milli-mənəvi dəyərlərin mahiyyətini şagirdlərə aşılaması çox vacibdir. "Kiçikyaşlı məktəblilərin milli-mənəvi dəyərlər əsasında tərbiyəsi işini asanlaşdırmaq məqsədilə *"Azərbaycan dili" dərsliklərinə müxtəlif bədii mətnlər - şeir, hekayə, rəvayət, nağıllar, dastanlardan parçalar, təmsillər, atalar sözləri və məsəllər, tapmacalar daxil edilmişdir ki, müəllim onlaradan yaradıcılıqla istifadə etməlidir" (Kərimov, 2003: 87).*

İbtidai siniflərdə öyrədilən həmin bədii mətnlər kiçikyaşlı məktəblilərdə əxlaqi- mənəvi keyfiyyətlər, ölkəmizin tarixi mədəniyyəti, təbii sərvətləri, canlı təbiəti, Azərbaycanın mərd oğul və qızları, milli qəhrəmanları, vətənpərvərlik haqqında sadə anlayışlar yaratmaqla, onların əqli, əxlaqi, estetik, fiziki cəhətdən formalaşması prosesi həyata keçirilir. Bütün bunlar kiçik yaşlı məktəblilər üçün dəyərli əxlaqi – etik tərbiyə məktəbidir.

Həmin materiallar şagirdlərin şüuruna və hisslərinə təsir göstərmək, mənəvi-əxalqi mövzularda söhbətlər aparmaq üçün əlverişli imkanlar yaradır. Müəllimlərə kömək məqsədilə Azərbaycan dili dərsliklərində məktəblilərin əxlaq tərbiyəsində dostluq və yoldaşlıq, düzlük və doğruçuluq, ədalətlilik, əməksevərlik, sadəlik və təvazökarlıq və yaşlılara hörmət, qayğı, ehtiram və s. bu kimi əxlaqi keyfiyyətlərin aşılanması xüsusi başlıqlar altında verilmişdir ki, onlar aşağıdakılardır:

-“Böyüyə hörmət həmişə vacibdir”;
- “Həmişə yaxşılığa yoldaş ol”;
- “Hamıya hörmət et ki, hörmətin olsun”;
-“Böyüksüz ev viran qalar”;
- “Böyük sözünə baxmayan böyürə-böyürə qalar”;
-“Min eşit, bir söylə”;
“Paltarını təzə ikən, namusunu gənc ikən qoru”;
“Qonaq sevənin süfrəsi boş olmaz”;
“Yaxşılıq et, yamanlıqdan qaç, etdiyin yaxşılığı başa vurma”;
“Şərəflə, ləyaqətlə yaşamaq hər bir insanın insanlıq borcudur”;
“Vicdan daxildən gələn ikinci səsdir”.

Bunlarla bərabər digər müdrik xalq kəlamlarının mənasının açıqlanması bədii mətnlərdə müxtəlif yollarla əks etdirilir və kiçik yaşlı məktəblilər həmin nümunələrlə tanış olduqca onların əxlaq və mənəviyyat haqqında düşüncələri formalaşır, dünyagörüşləri genişlənir və heç şübhəsiz onların əxlaq tərbiyəsinə də müsbət təsir etmiş olur.

Dərslikdə verilmiş hekayələrin, müxtəlif məzmunlu mətnlərin oxunması şagirdlərdə bir sıra müsbət psixoloji, əqli, əxlaqi, intellektual keyfiyyətlər aşılamış olur. *“Hekayələr şagirdlərin biliyini zənginləşdirir; nitqini inkişaf etdirir, zehnini açır, onların empatiya gücünü genişləndirir, ünsiyyət mədəniyyəti, mənavi mədəniyyət yaradır, yaradıcı qabiliyyətlərini, məntiqi təfəkkürünü inkişaf etdirir, tolerantlıq formalaşdırır” (Həsənov A, 1997:49).*

İbtidai siniflər üzrə hazırlanmış yeni dərsliklərin məzmununa nəzər salsaq dərslikdə verilən materialların əsas mahiyyəti və istiqamətlərini belə müəyyənləşdirə bilərik:

1. Şagirdlərin təlim marağını gücləndirir.
2. Şagirdləri axtarışlara, yeni məlumatlar əldə etməyə sövq edir.
3. Şagirdlərin məntiqi və yaradıcı təfəkkürünü inkişaf etdirir.
4. Şagirdlərin əxlaqi – mənəvi keyfiyyətlərini və məntiqi təfəkkürünü inkişaf etdirir.
5. Tətbiqi xarakter daşımaqla zəruri həyati bacarıqların formalaşmasına zəmin yaradır.
6. Fəal və intearktiv təlim şəraitinin yaradılmasını, yeni pedaqoji texnologiyalardan istifadəni tələb edir.
7. Şagirdlərin fərqli idraki imkanlarının nəzərə alınmasına əlverişli şərait və imkanlar yaradır.

Yeni dərslik komplektlərində nəticələrin təqdimat formaları konkret və rəngarəngdir. Bunlara ifadə yazılar, təsvirlər, əsərlər, şeirlər, esselər sxemlər, cədvəllər, qrafiklər; illüstrasiyalar, kitablar, qəzetlər; nağıllar, tapmacalar, atalar sözləri, zərb məsəllər, uydurmalar, yanıltmaclar, təcrübələr, eksperimentlər; maketlər, modellər, rəmzlər, layihələr, səhnələşdirmələr, referatlar, krossvordlar, və s. daxildir.

İbtidai siniflərin dərsliklərində verilmiş bədii mətnlərin bir qismində vətənpərvərlik, igidlik, mətanətlilik, vətənə sadiqlik, yaşadığı ölkəni sevmək, onun nailiyyətlərinə sevinmək, həyatını, canını və qanını həmin yurdun, ocağın, torpağın, ölkənin, xalqın səadəti və azadlığı, xoşbəxtliyi uğrunda mübarizəyə həsr etmək, ana təbiətin gözəlliklərinə valeh olmaq, Vətənin daha da çiçəklənməsində var gücü ilə çalışmaq, lazım gələrsə Vətən yolunda mərdlik əxlaqi keyfiyyətlər kimi təqdim olunur.

İbtidai sinif şagirdlərinin mənəvi tərbiyəsinin formalaşdırılması zamanı sinif müəllimləri təkcə dərs prosesində istifadə olunan dərsliklərlə kifayətlənməməli eyni zamanda bədii əsərlərdən də istifadə etməklə bu işi daha yaxşı bir şəkildə həyata keçirə bilərlər.

Bu sahədə Azərbaycan xalq dastanları, nağıllar, hekayələr, dəyərli şeirlər, xalq ədəbiyyatı nümunələrindən xeyli dərəcədə faydalanmaq olar.

Məsələn hər hansısa bir vətənpərvərliklə bağlı olan bədii əsərdəki müsbət baş qəhrəmanın etmiş olduğu hərəkətləri, orada verilmiş olan nümunələri kiçik yaşlı məktəblilərin diqqətinə çatdırmaqla, şüuruna hopdurmaqla vətənpərvərliik keyfiyyətlərinin tərbiyə olunmasını daha yaxşı həyata keçirə bilərik.

## Nəticə

İbtidai sinif şagirdlərinin mənəvi tərbiyəsinin formalaşdırılması nə qədər təlim prosesi ilə bağlıdırsa, eyni zamanda müəllimin pedaqoji ustalığından, səriştəliliyindən dərsi təşkil etmə qabiliyyətindən də çox asılıdır. Yəni təkcə bu zaman yük dərs prosesinə üstünı deyil, həmçinin müəllimlərin də üzərinə böyük və məsuliyyətli vzifələr düşür. Müəllimlər dərs prosesini elə təşkil etməlidirlər ki, şagirdlərin özləri dərsə maraqlı olsun, mövzuya motivasiya olsun, dərsə böyük maraq və həvəslə yanaşsınlar.

Müəllimlər hər hansı bir məsələ haqqında şagirdlərə qısa konkret olaraq məlumat verirlərsə, kiçik yaşlı məktəblilərin özləri isə bu məlumatları köklü şəkildə araşdırmalı və çox geniş bir məlumat əldə etməlidirlər.

Yəni müəllimlər dərsi o qədər maraqlı təşkil etməlidirlər ki, şagirdlər davamlı olaraq dərs prosesində fəallıq göstərməyə meyilli olsunlar. Bu zaman dərsin səmərəsi və təhsilin keyfiyyəti yüksək olar

## Ədəbiyyat

1. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (2008), (Milli Kurikulum) Kurikulum.
2. Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu (2009), Bakı: Ozan.
3. Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı (1999), Bakı: Çaşıoğlu.
4. Əliyev, H.Ə. (1996), Müstəqil Azərbaycan Respublikası Gənclərinin Birinci Forumunda nitq, Azərbaycan qəz. Bakı: Mütərcim.
5. Əliyev, İ.H. (2013), Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Bakı.
6. Həsənov, A.M. (1997), Azərbaycan uşaq ədəbiyyatındakı mənəvi dəyərlərdən kiçikyaşlı məktəblilərin əxlaq tərbiyəsində istifadə. Bakı: İşıq.
7. Hüseynzadə, R.L.(2021), Pedaqogika. Dərslik. Bakı: Mütərcim.
8. İsmayılov R. Orucova G., Xəlilov Z. (2013), Azərbaycan dili. II sinif. Dərslik. Bakı: Altun kitab.
9. İsmayılov R., Abdullayeva S. Cəfərova D. (2012), Azərbaycan dili. I sinif. DərslikBakı: Altun kitab.
10. İsmayılov, R., Abdullayeva S., Cəfərova D. (2010), Azərbaycan dili. IV sinif. Dərslik. Bakı: Altun kitab.
11. İsmayılov, R., Orucova G., Cəfərova D. (2010), Azərbaycan dili. III sinif. Dərslik. Bakı: Altun kitab.
12. Kərimov, Y.Ş. (2003), İbtidai məktəbdə ana dilinin tədrisi metodikası. Bakı: Maarif.
13. Tusi (1989), Əxlaqi Nasiri. Bakı:Elm.

**Rəyçi: p.ü.e.d. Rüfət Hüseynzadə**

Göndərildi: 05.06. 2022 Qəbul edildi: 25.07. 2022

# TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/81/44-49

**Şairə Əli qızı Quliyeva**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
sairequliyeva001@gmail.com
**Yasin Ramid oğlu Aslanov**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
aslanov.yasin@inbox.ru
**Kənan Ədalət oğlu Məmmədov**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
kananmemmedov76@mail.ru.
**Elmira Həmid qızı Əliyeva**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
elmiraliyeva 405@mail.ru

# YUBİLEY VƏ GÜMÜŞÜ ADLER QUŞ CİNSİ XƏTLƏRİNİN XORUZLARININ YERLİ TOYUQLARLA ÇARPAZLAŞDIRILMASINDA MƏHSULDARLIĞIN ÖYRƏNİLMƏSİ

**Xülasə**

Tədqiqatın gedişində qarşıda duran vəzifəni yerinə yetirmək məqsədilə yerli populyasiyalardan olan toyuqlarla çarpazlaşdırma aparmaq üçün yumurtalıq-ətlik istiqamətli, yüksək məhsuldar Yubiley Kuçinsk və Gümüşü Adler (Susex) cinsinin genetik potensialından istifadə edilmiş, müxtəlif cinslərdən olan toyuqlar arasında çarpazlaşdırma həyata keçirməklə alınan bir neçə nəsil cücələr üzərində tədqiqat işi davam etdirilmişdir.

Nəzarət qrupundakı toyuqların inkubasiya göstəriciləri cinsə xarakterik olan göstəricilərdən (cücə çıxımı faizi 75-80%) ciddi surətdə fərqlənmir.Təcrübə qrupunda isə bu göstərici nəzarət qrupunun toyuqlarına nisbətən 9,6% yüksək olmuşdur. Bunu hər iki cinsin xoruzlarının daha yüksək cinsi aktivliyə malık olması ilə əlaqələndirmək olar.

Tədqiqatın gedişində ana sürü toyuqları üzərində nəzarət təşkil olunmuş məhsuldarlıq və damazlıq keyfiyyətləri öyrənilmişdir.150 günlük təcrübə dövrü ərzində (may-oktyabr) yaşlı toyuqlardan əldə olunmuş yumurta məhsuldarlığının uçotu aparılmış və yumurta məhsuldarlığına aid göstəricilər qeydə alınmışdır.

***Açar sözlər:*** *populyasiya, hibrid, çarpazlaşdırma, xətt, inkubasiya, canlı kütlə, cücə çıxımı*

**Shaira Ali Guliyeva**
**Yasin Ramid Aslanov**
**Kanan Adalat Mammadov**
**Elmira Hamid Aliyeva**

# Learning the productivity of the rooster lines of Jubilee and Silver Adler bird breed by crossing with local hens

**Abstract**

The genetic potential of high-yielding egg-meat-oriented Kuchinsk and Silver Adler (Susex) breeds were used for crossbreeding chickens from local populations and the research on several generations of chickens was proceeded by crossbreeding among chickens of different breeds.

The incubation rates of chickens in the control group did not differ significantly from the specification of breed indicators (hatching 75-80%). In the experimental group, this figure was 9.6% higher than in the control group. This can be related to the fact that roosters of both breeds have higher sexual activities.

In the course of the study, the productivity and breeding qualities of hens were studied. During the 150 days of experiment (May-October), the egg productivity of adult chickens was reported and indicators of the egg productivity were recorded.

***Keywords***: *population, hybrid, crossbreeding, line, incubation, live mass, hatching*

## Giriş

Respublikamızda quşçuluğu sənaye əsasında inkişaf etdirmək, yumurta və quş əti istehsalını artırmaq, əhalinin həmin məhsullara olan tələbatını ödəmək üçün az iş görülməmişdir. Yəni, ixtisaslaşdırılmış iri təsərrüfatların sayı günü-gündən artaraq, onların maddi texniki bazası möhkəmləndirilmiş və avtomatlaşdırılmış, mövcud quşçuluq müəssisələrində yenidənqurma işləri aparılmış və onlar daha müasir avadanlıqlarla təchiz edilmişdir. Nəticədə isə quşların miqdarca sayı, məhsuldarlıq göstəriciləri artmış və cinsi isə xeyli yaxşılaşdırılmışdır. Son illər quşçuluq məhsullarına olan tələbat xeyli artmış, lakin buna baxmayaraq əhalinin bu məhsullara olan tələbatı ödənilmir. Quşçuluq məhsullarına getdikcə artan tələbatı ödəmək, həmçinin bu sahəni daha yüksək inkişaf səviyyəsinə çatdırmaq üçün elmi surətdə əsaslandırılmış üsullar işlənib hazırlanmalıdır. Heyvandarlığın tez yetişən sahələrindən biri olan quşçuluq ərzaq ehtiyatlarını artırmaq üçün böyük mənbədi (Bondareva, 2007: 27).

Bu sahənin intensiv inkişaf etdirilməsinə son illər respublikamızda böyük əhəmiyyət verilir. Əhalinin quş ətinə və yumurtaya olan tələbatını ödəmək üçün quşçuluğu sənaye əsasında inkişaf etdirmək lazımdır. İctimai heyvandarlığı və onun bir bölməsi olan quşçuluğu sürətlə inkişaf etdirmək vəzifəsi Azərbaycanda xüsusi bir kəskinliklə qarşıda durur.

Yumurta və quş əti istehsalı əsasən, ixtisaslaşdırılmış iri təsərrüfatlarda və quşçuluq fabriklərində mərkəzləşdirilib. Azərbaycanda yumurta və quş əti istehsal etmək üçün 55-dən yuxarı iri quşçuluq fabrikləri fəaliyyət göstərir (Hacıyev, 2003: 12).

Respublikamızda ölkə əhalisinin kənd təsərrüfatı məhsullarına olan tələbatını istər quşçuluq, qoyunçuluq və maldarlıq sahəsində ödəmək və genefondu qoruyub saxlamaq, sahibkarların bu sahəyə olan marağını artırmaq üçün aparılan elmi-tədqiqat işi aktualdır.

Respublikamıza gətirilmiş olan mədəni toyuq cinslərinin birinci növbədə məhsuldarlığını saxlamaq, onların saxlandığı zonalarda bioloji təsərrüfat xüsusiyyətlərini öyrənməklə və damazlıq seleksiya işlərini düzgün aparmaq yolu ilə ümumi məhsuldarlığı artırmaq olar.

Apardığımız elmi tədqiqat işi respublikaya xaricdən gətirilmiş yüksək keyfiyyətli məhsuldarlığa malik yeni xətt və krossların yaradılması, qarışıq istiqamətli toyuq cinslərinin və xətlərinin genetik potensialının öyrənilməsi, yemlənmə və saxlanma şəraitinin quşların fizioloji-boikimyəvi və morfo-funksional vəziyyətinə təsirinin işlənib hazırlanması, damazlıq və məhsuldarlıq keyfiyyətlərinin təkmilləşdirilməsi öyrənilib (Mirzəyev, 2010: 39)

Ətlik-yumurtalıq istiqamətli iki müxtəlif xətt seçilərək hər biri ayrı ayrılıqda saxlanılmaqla gələcəkdə 4 müxtəlif qurupdan ibarət və həmin qurupdan iki formada valideyin sürüsü yaradılıb. Alınan birinci nəsildə iki müxtəlif hibrid quş əldə olunub və beləliklə gələcəkdə yeni quş xəttlərinin yaradılmasının əsası qoyulub.

Yemlənmə və saxlanma şəraitinin orqanizmə təsirini araşdırmaq məqsədilə vaxtaşırı normal fərdlərdən kəsilərək əzələ, skelet və parenximatoz orqanların inkişaf dinamikasının tədqiqi və həmin nümunələrin kimyəvi tərkibinin təyini təhlil olunacaq (Şəkil 1)




**Şək.1.Elmi-tədqiqat işinin sxeması**

Tədqiqatın gedişində qarşıda duran vəzifəni yerinə yetirmək məqsədilə yerli populyasiyalardan olan toyuqlarla çarpazlaşdırma aparmaq üçün yumurtalıq-ətlik istiqamətli, yüksəkməhsuldar Yubiley Kuçinsk və Gümüşü Adler (Susex) cinsinin genetik potensialından istifadə edilmiş, müxtəlif cinslərdən olan toyuqlar arasında çarpazlaşdırma həyata keçirməklə alınan bir neçə nəsl cücələr üzərində tədqiqat işi davam etdirilmişdir (Cədvəl 1).

**İnkubasiyanın nəticələri aşağıdakı cədvəldə əks olunmuşdur.**

***Cədvəl 1***

| **Göstəricilər** | **Q r u p l a r** | |
|---|---|---|
| | **I (Təcrübə)** | **II (Nəzarət)** |
| İnkubatora qoyulmuş yumurtaların sayı, ədəd | 52 | 52 |
| Mayalanmış yumurtaların sayı,ədəd | 49 | 46 |
| Yumurtanın mayalanma faizi, % | 94.2 | 88.5 |
| Sağlam cücələrin sayı, baş | 45 | 40 |
| Cücə çıxımı, % | - | - |
| Qoyulmuş yumurtaların sayına görə, %-lə | 86.5 | 76.9 |
| Mayalanmış yumurtaların sayına görə, %-lə | 91,8 | 87.0 |
| Bəslənməyə götürülmüşdür, baş | 35 | 35 |

Cədvəldən göründüyü kimi, nəzarət qrupundakı toyuqların inkubasiya göstəriciləri cinsə xarakterik olan göstəricilərdən (cücə çıxımı faizi 75-80%) ciddi surətdə fərqlənmir.Təcrübə qrupunda isə bu göstərici nəzarət qrupunun toyuqlarına nisbətən 9,6% yüksək olmuşdur. Bunu hər iki cinsin xoruzlarının daha yüksək cinsi aktivliyə malık olması ilə əlaqələndirmək olar.

Göstərmək lazımdır ki, Gümüşü Adler cinsi ətlik-yumurtalıq istiqamətli cins (Dominant Susseks) yumurtalıq-ətlik istiqamətli quşlar olduğuna görə, təcrübə qrupundakı xoruzların canlı kütləsi 3,2 kq, nəzarət qrupundakı xoruzların canlı kütləsinə 3,6 kq nisbətən aşağıdır. Ona görədə onlar Gümüşü Adler xoruzlarına nisbətən daha aktivdirlər.

İnkubasiyanın digər göstəricilərinə görə də, təcrübə qrupundakı cücələr öz həmyaşıdlarından üstün olmuşlar. Onlar yumurtanın mayalanmasına görə nəzarət qrupu cücələrindən7,0%, sağlam cücə çıxımına görə isə 6,0 baş, yəni 12,2% yüksək olmuşlar.

İnkubasiyadan yeni çıxmış cücələr arasında, hər qrupdan 35 baş sağlam cücə seçilərək götürülmüş və təcrübə onların bəslənməsi üzrə davam etdirilmişdir.

Cücələrin bəslənməsi 60 gün davam etmişdir. Bunun üçün cücələr, arası torla kəsilmiş iki bərabər hissədə yerləşdirilmişdilər. Bəslənmə şəraiti hər iki qrupda eyni səviyyədə aparılmışdır. İlk vaxtlar normaya uyğun olaraq temperatur rejimi 33-32$^0$C-dən başlayaraq, gündə 1-2 dərəcə aşağı salınmış, nisbi nəmlik isə 55-60% səviyyəsində saxlanmışdır.

Cücələrin ilk günlərdə normal istilik alması mühüm əhəmiyyət kəsb edir.Təcrübələrlə sübut olunmuşdur ki, ilk 3 gün ərzində quş damında 15-20 sm hündürlükdə havanın istiliyi 32-33$^0$C olmalıdır. Əks halda orqanizm tərəfindən sarı maddənin sorulması gecikir, bu isə cavan cücələrin boyatma və inkişafına mənfi təsir göstərir. Ümumiyyətlə təsərrüfatlarda cavan quşların bəslənməsi zamanı aşağıdkı istilik rejiminin tətbiq olunması məsləhət görülür:

-İlk həftədə quş damında istilik 33-30$^0$C olmalı;

-İkinci həftədə istilik 29-27$^0$C-dək azaldılır;

-Üçüncü həftədən başlayaraq havanın istiliyi gündə 1-2$^0$C azaldılmaqla 30 günlük yaşınadək 20-18$^0$-yə qədər çatdırılır və bəsləmə dövrünün sonunadək bu qaydada saxlanılır.

Quş damında havanın istiliyini nəzarətdə saxlamaq üçün adi aptek termometrindən istifadə etmək olar.

Cücələrin boyatma və inkişafi haqqında aparılan tədqiqat işində hər 10 gündən bir, hər qrupdan 10 baş cücə seçilərək, 10, 30 və 60 günlükdə çəkilmiş və boyatma dinamikası nəzarət altında saxlanmışdır.

Aparılan nəzarət çəkinin nəticələrinə əsasən sutkalıq çəki artımı göstəricisi hesablanır. Bəsləmə dövrünün sonunda orta sutkalıq çəki artımı müəyyən olunur. Orta sutkalıq çəki artımı nə qədər yüksək olarsa, deməli yemləmə bir o qədər düzgün aparılmış və boyatma normal getmişdir.Cutkalıq çəki artımının yüksək olması yemdən səmərəli istifadə əmsalının da yüksəlməsinə zəmin yaradır. Cücələrin salamat saxlanma göstəricisi ölmüş cücələrin yiğılması yolu ilə öyrənilmişdir (cədvəl 3); (şəkil 2;); (şəkil 3).

**Quşçuluq təsərrüfatında yetişdirilən quşların həftəlik canlı kütlə göstəriciləri,n=10**

*Cədvəl 3*

| Aylar və həftələr üzrə | Canlı kütlə (qr,kq) | Döş qucumu (sm) | Döşün eni (sm) | Döş sümüyü (sm) | Qanəd sümüyü (sm) | 4-cü qanəd lələyinin uzunluğu (sm) | Bədənin düz uzunu (sm) |
|---|---|---|---|---|---|---|---|
| 29.04.(1 həftə) | 820 | 99 | 24 | 70,5 | 75 | 31.5 | 92 |
| 06.05(2 həftə) | 2,460 | 120 | 27 | 169 | 85 | 58 | 126 |
| 12.05(3 həftə) | 3,485 | 148 | 39.6 | 86.5 | 93 | 79 | 147 |
| 20.05(4 həftə) | 4.710 | 178 | 47 | 91.5 | 106 | 134 | 197 |




**Şək.2. Quşların həftələr üzrə canlı kütlə dinamikası**




**Şək 3. Quşçuluq təsərrüfatında yetişdirilən quşların bədən indekslərinin həftəlik inkişaf dinamikası göstəriciləri, n=1**

Tədqiqatın gedişində ana sürü toyuqları üzərində nəzarət təşkil olunmuş məhsuldarlıq və damazlıq keyfiyyətləri öyrənilmişdir.150 günlük təcrübə dövrü ərzində (may-oktyabr) yaşlı toyuqlardan əldə olunmuş yumurta məhsuldarlığının uçotu aparılmış və yumurta məhsuldarlığına aid göstəricilər qeydə alınmışdır.

Bu Dominant Susseks (Gümüşü Adler) cinsinin xoruzlarının cinsi aktiv olması ilə əlaqələndirilir. Dominant Susseks cinsi əsasən yumurtalıq-ətlik istiqamətli olduqları üçün, toyuqların yumurta məhsuldarlığına müsbət təsir göstərmiş, nəticədə təcrübə qrupunda toyuqların yumurta məhsuldarlığı nəzarət qrupuna nisbətən 480 ədəd və ya 12,8% yüksək olmuşdur.

Bunu hər iki cinsin xoruzlarının daha yüksək cinsi aktivliyə malık olması ilə əlaqələndirmək olar.

## Nəticə

**1.** Tədqiqat dövründə inkubasiyanın nəticələrinin təhlili zamanı məlum olmuşdur ki, təcrübə qrupunda cücə çıxımı göstəricisi, nəzarət qrupuna nisbətən 9,6% yüksək olmuşdur.Bu Dominant Sussekscinsinin xoruzlarının cinsi aktiv olması iləəlaqələndirilir.

**2.** Dominant Susseks cinsi əsasən yumurtalıq-ətlik istiqamətli olduqları üçün, toyuqların yumurta məhsuldarlığına müsbət təsir göstərmiş, nəticədə təcrübə qrupunda toyuqların yumurta məhsuldarlığı nəzarət qrupuna nisbətən 480 ədəd və ya 12,8% yüksək olmuşdur.

**3.** Cücələr üzərində aparılan tədqiqat işinin nəticələri, hər iki qrup arasında prinsipial fərqin olmamasını göstərmişdir, yalnız salamat saxlanma faizi təcrübə qrupunda nisbətən yüksək olmuşdur.

**4.** Tədqiqatın nəticələri, yerli toyuqların damazlıq və məhsuldarlıq keyfiyyətlərinin yüksəldilməsində hibrid quşların və krossların istifadə olunmasının əhəmiyyətli olmasını sübut etmişdir.

## Ədəbiyyat

1. Bondareva, E.I. (2007), Familiam gallinae rusticam, Moskva : Profisdat ast. Astrel.
2. Fisinin,V. I. (2011), Pascens gallinis. Moskva : Geotar- medina.
3. Galpern, I.L. (2011), Nova principia pro creatione cruces pulli domestici. Moskva :MMII, Gallina Colenda.
4. Gözəlov, Y.Q. (2017), Heyvandarın məlumat kitabı. Gəncə.
5. Hacıyev, M.H. (2003), Azərbaycanda toyuq genofondlarının bərpa və təkmilləşdirilməsi. AKTA:, Gəncə-Kars simpoziumun materialları.
6. Hacıyev, M.H. (2006), Quşçuluqda hibridləşmənin genetik əsasları.Gəncə:, AKTA
7. Hacıyev, M.H. (2019), Mirzəyev F.M., Məmmədov, S.N. İskəndərova A.C. Hacıyev Q.H. Qarışıq istiqamətli toyuqların bəslənmə texnologiyası. Gəncə.
8. Mirzəyev F.M., Gözəlov Y.Q. (2010), Sahibkar quşçuluq təsərrüfatlarında cavan quşların bəslənmə texnologiyası, ADTU. Gəncə

9. Mirzəyev, F.M. Gözəlov,Y.Q. (2010), Quşçuluq təsərrüfatlarında cavan quşların bəslənmə texnologiyasına dair tövsiyyələr. Az.Tex.Universiseti.
10. Wright.A. (2017), Gallinae incipientium. Eksma.
11. Zhmalin M.S. (2011), Efficax gallinae rusticae. Kharkov, Vladis.
12. http://abc.az/mobile/view.php?id=39919&lng=az
13. https://www.azstat.org/MESearch/search?departament=5&lang=az

**Rəyçi: a.e.f.d. Qafar Məmmədov**

Göndərildi: 20.06. 2022 Qəbul edildi: 25.07. 2022

# İÇİNDƏKİLƏR

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
## HUMANITIES AND SOCIAL SCIENCES



## TƏBİƏT ELMLƏRİ
## NATURAL SCIENCES



Çapa imzalanmışdır: 17.08.2022
Kağız formatı: 60/84
H/n həcmi: 6,25 ç.v.
Sifariş: 550

"ZƏNGƏZURDA" çap evində çap olunub
**Ünvanı:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru